**1. Hemofil bakteriyaların kultivasiyası üçün tətbiq edilir:**

A) şokalad aqar

B) ət-peptonlu aqar

C) Endo mühiti

D) Saburo mühiti

E) zərdablı aqar

**2. İnkişafı üçün X və V amillərinin olmasını tələb edir:**

A) Haemophilus influenzae

B) Mycobacterium tuberculosis

C) Clostridium perfringens

D) Streptococcus pneumoniae

E) Pseudomonas aeruginosa

**3. Haemophilus influenzae:**

A) Qram mənfi, hərəkətsiz, spora əmələ gətirməyən çöpvari bakteriyadır

B) Qram mənfi, hərəkətli, spora əmələ gətirməyən çöpvari bakteriyadır

C) Qram mənfi, hərəkətli, spora əmələ gətirməyən kokşəkilli bakteriyadır

D) Qram müsbət, hərəkətli, spora əmələ gətirməyən çöpvari bakteriyadır

E) Qram müsbət, hərəkətsiz, spora əmələ gətirməyən çöpvari bakteriyadır

**4. Burun boşluğundan tamponla götürülmüş materialın qanlı aqarda kultivasiyasından sonra stafilokokların əmələ gətirdiyi hemoliz zonasında kiçik, yarım-şəffaf satellit koloniyalar müşahidə edilmişdir. Bu koloniyaların hansı bakteriyaya məxsus olmasını ehtimal etmək olar?**

A) Haemophilus influenzae

B) Bordetella pertussis

C) Staphylococcus epidermidis

D) Klebsiella pneumoniae

E) Pseudomonas aeruginosa

**5. Qanlı aqarda bəzi bakteriyaların əmələ gətirdiyi hemoliz zonasında hemofil bakteriyaların inkişafı necə adlanır?**

A) satellizm fenomeni

B) parazitizm fenomeni

C) kapsulanın şişmə fenomeni

D) neqativ koloniyalar fenomeni

E) dissosiasiya fenomeni

**6. Haemophilus influenzae-nın əsas patogenlik amilidir:**

A) kapsula

B) ekzotoksin

C) spora

D) fibrinolizin

E) lesitinaza

**7. Haemophilus influenzae-nın insan patologiyasında mühüm rol oynayan əsas serotipidir:**

A) b serotipi

B) a serotipi

C) d serotipi

D) e serotipi

E) f serotipi

**8. Haemophilus influenzae-nın törətdiyi xəstəliklərə aiddir:**

**1.Qazlı qanqrena;**

**2.Yumşaq şankr;**

**3.Qızıl yel;**

**4.Epiqlottit;**

**5.Meningit**

A) 4, 5

B) 1, 3

C) 2, 5

D) 3, 4

E) 2, 4

**9. Meningit əlamətləri olan 3 yaşlı uşağın serebrospinal mayesindən şokalad aqarında inkişaf edən Qram mənfi, hərəkətsiz, polimorf çöpvari bakteriya əldə edilmişdir. Ehtimal edilən törədici:**

A) Haemophilus influenzae

B) Neisseria meningitidis

C) Streptococcus pneumoniae

D) Pseudomonas aeruginosa

E) Escherichia coli

**10. Hemofil bakteriyaların törətdiyi xəstəliklərin diaqnostikasında istifadə edilir:**

A) bakterioloji üsul

B) bioloji üsul

C) molekulyar-genetik üsul

D) dəri-allergik reaksiya

E) radioimmun metod

**11. Haemophilus influenzae-nın *aegypticus* biovarı tərəfindən törədilir:**

A) irinli konyuktivit

B) yumşaq şankr

C) qızıl yel

D) qazlı qanqrena

E) infeksion eritema

**12. Braziliya purpur qızdırmasının törədicisidir:**

A) Haemophilus influenzae *aegypticus* biovarı

B) Haemophilus influenzae b serotipi

C) Chlamydia trachomatis D-K serotipi

D) Streptococcus pneumoniae

E) Pseudomonas aeruginosa

**13. Haemophilus ducreyi:**

A) Qram mənfi, hərəkətsiz, spora əmələ gətirməyən çöpvari bakteriyadır

B) Qram mənfi, hərəkətli, spora əmələ gətirməyən çöpvari bakteriyadır

C) Qram mənfi, hərəkətli, spora əmələ gətirməyən kokşəkilli bakteriyadır

D) Qram müsbət, hərəkətli, spora əmələ gətirməyən çöpvari bakteriyadır

E) Qram müsbət, hərəkətsiz, spora əmələ gətirməyən çöpvari bakteriyadır

**14. Yumşaq şankrın törədicisidir:**

A) Haemophilus ducreyi

B) Chlamydia trachomatis

C) Treponema pallidum

D) Pseudomonas aeruginosa

E) Clostridium perfringens

**15. Yumşaq şankr yoluxur:**

A) cinsi yolla

B) fekal-oral mexanizmlə

C) transmissiv mexanizmlə

D) hava-damcı mexanizmi ilə

E) qida və su yolu ilə

**16. Gardnerella vaginalis törədir:**

A) bakterial vaginoz

B) süzənək

C) yumşaq şankr

D) zöhrəvi limfaqranuloma

E) irinli konyuktivit

**17. Uşaqlıq yolundan götürülmüş materialdan hazırlanmış yaxmalarda "açar hüceyrələrin" olması hansı xəstəlik üçün xarakterdir?**

A) bakterial vaginoz

B) süzənək

C) yumşaq şankr

D) zöhrəvi limfaqranuloma

E) urogenital xlamidioz

**18. Uşaqlıq yolundan götürülmüş materialdan hazırlanmış və Qram üsulu ilə boyadılmış yaxmada "açar hüceyrələr" aşkar edilmişdir. Ehtimal edilən törədici:**

A) Gardnerella vaginalis

B) Neisseria gonorrhoeae

C) Haemophilus ducreyi

D) Chlamydia trachomatis

E) Treponema pallidum

**19. Uşaqlıq yolundan götürülmüş materialdan hazırlanmış yaxmada səthi kiçik və Qram üsulu ilə dəyişkən boyanmış kokobasillərlə örtülü olan epitel hüceyrələri aşkar edilmişdir. Bakterial vaginoz üçün xarakter olan bu hüceyrələr necə adlanır?**

A) açar hüceyrələr

B) tüklü hüceyrələr

C) penton hüceyrələr

D) satellit hüceyrələr

E) adheziv hüceyrələr

**20. Qardnerellozun klinik təzahürlərinə aid *deyil*:**

A) yumşaq şankr

B) bakterial vaginoz

C) endometrit

D) salpinqooforit

E) qeyri-spesifik uretrit

**21. Bakterial vaginozun diaqnostikasında istifadə edilən əsas üsuldur:**

A) mikroskopik üsul

B) bioloji üsul

C) bakterioloji üsul

D) dəri-allergik reaksiya

E) seroloji üsul

**22. Bakterial vaginozun müalicəsi üçün seçim preparatıdır:**

A) metronidazol

B) flukonazol

C) tetrasiklin

D) gentamisin

E) ofloksasin

**23. Bordetella pertussis:**

A) Qram mənfi, hərəkətsiz, kapsulalı kokobasillərdir

B) Qram mənfi, hərəkətli, kapsulalı kokobasillərdir

C) Qram mənfi, hərəkətli, kapsulalı vergülşəkilli bakteriyadır

D) Qram müsbət, hərəkətli, sporalı kokobasillərdir

E) Qram müsbət, hərəkətsiz, sporalı çöpvari bakteriyadır

**24. Göy öskürəyin törədicisidir:**

A) Bordetella pertussis

B) Haemophilus influenzae

C) Chlamydia trachomatis

D) Klebsiella pneumoniae

E) Burkholderia mallei

**25. Göy öskürəyə bənzər xəstəliyin törədicisidir:**

A) Bordetella parapertussis

B) Haemophilus parainfluenzae

C) Bordetella pertussis

D) Klebsiella pneumoniae

E) Burkholderia mallei

**26. Bordetella pertussis kultivasiya edilir:**

A) kazein kömürlü aqarda

B) Endo mühitində

C) Saburo mühitində

D) 1%-li peptonlu suda

E) ət-peptonlu aqarda

**27. Bordetella pertussis kazein kömürlü aqarda əmələ gətirir:**

A) civə damlasına oxşar, parıltılı koloniyalar

B) şir yalını xatırladan qırışıq koloniyalar

C) ətrafı haşiyəli dəsmalı xatırladan koloniyalar

D) şüşə qırıntılarını xatırladan koloniyalar

E) molyar dişləri xatırladan koloniyalar

**28. Bordetella pertussis-in patogenlik amillərinə aiddir:**

**1.Xovlar;**

**2.Pertussis-toksin;**

**3.Eritrogen toksin;**

**4.Traxeal toksin;**

**5.Protein A;**

A) 1, 2, 4

B) 1, 3, 4

C) 1, 2, 3

D) 3, 4, 5

E) 2, 4, 5

**29. Pertussis-toksinin təsir mexanizmi:**

A) hüceyrələrdə siklik adenozinmonofosfatın miqdarını artırır

B) hüceyrələrdə qlikogenin miqdarını artırır

C) hüceyrələrdə siklik adenozinmonofosfatın sintezini dayandırır

D) hüceyrələrdə zülal sintezini dayandırır

E) hüceyrələrdə aromatik aminturşuların miqdarını artırır

**30. Bu bakteriyanın ekzotoksini yüksək dermonekrotik effektə malikdir, limfositoz törədir, insulin hasilatını, histaminə və serotoninə qarşı həssaslığı artırır:**

A) Bordetella pertussis

B) Neisseria gonorrhoeae

C) Bacillus anthrasis

D) Yersinia pestis

E) Brucella melitensis

**31. Göy öskürək yoluxur:**

A) hava-damcı mexanizmi ilə

B) fekal-oral mexanizmlə

C) transmissiv mexanizmlə

D) qida yolu ilə

E) su yolu ilə

**32. Göy öskürəyin patogenezi:**

A) törədicilər bronx epitelinə adheziya olunaraq orada çoxalır

B) törədicilər bronx epitelinə daxil olaraq orada çoxalır

C) törədicilər bronxların selikli qişasından qana keçir

D) törədicilərin qanda parçalanması nəticəsində pertussis-toksin azad olur

E) törədicilər nazik bağırsaq epitelinə adheziya olunaraq orada çoxalır

**33. Bakteriemiya ilə müşayiət *olunmur*:**

A) göy öskürək

B) qarın yatalağı

C) leptospiroz

D) bruselloz

E) meninqokoksemiya

**34. Bu xəstəlikdən sonra davamlı immunitet formalaşır, təkrar xəstələnmə az hallarda müşahidə edilir:**

A) göy öskürək

B) sifilis

C) vərəm

D) bruselloz

E) süzənək

**35. Göy öskürəyin diaqnostikasında istifadə edilir:**

A) bakterioloji üsul

B) mikroskopik üsul

C) bioloji üsul

D) dəri-allergik reaksiya

E) Rayt reaksiyası

**36. Göy öskürəyin diaqnostikasında ən həssas üsuldur:**

A) zəncirvari polimeraza reaksiyası

B) immunoblottinq

C) Elek üsulu

D) Mantu reaksiyası

E) Rayt reaksiyası

**37. Göy öskürəkli xəstələrlə təmasda olanlara təyin edilir:**

A) immunoqlobulin

B) anatoksin

C) immun zərdab

D) interferon

E) adsorbsiya edilmiş vaksin (AGDT vaksini)

**38. Bu xəstəliyin profilaktikası məqsədilə uşaqlar planlı şəkildə vaksinasiya olunur:**

A) göy öskürək

B) skarlatina

C) qara yara

D) revmatizm

E) qarın yatalağı

**39. Göy öskürəyin spesifik profilaktikasında tətbiq edilir:**

A) adsorbsiya edilmiş vaksin (AGDT vaksini)

B) tərkibində pertussis-toksinə qarşı anticisimlər olan immun zərdab

C) tərkibində pertussis-toksin olan vaksin

D) tərkibində törədicilərə qarşı anticisimlər olan immun zərdab

E) tərkibində traxeal toksinə qarşı anticisimlər olan immun zərdab

**40. Göy öskürəyin müalicəsində istifadə edilir:**

A) eritromisin

B) adsorbsiya edilmiş vaksin (AGDT vaksini)

C) anatoksin

D) tərkibində törədicilərə qarşı anticisimlər olan immun zərdab

E) tərkibində pertussis-toksinə qarşı anticisimlər olan immun zərdab

**41. Brusellalar:**

A) Qram mənfi, hərəkətsiz, spora əmələ gətirməyən kokobasillərdir

B) Qram mənfi, hərəkətli, sporalı kokobasillərdir

C) Qram mənfi, hərəkətli, kapsulalı vergülşəkilli bakteriyadır

D) Qram müsbət, hərəkətli, spora əmələ gətirməyən çöpvari bakteriyadır

E) Qram müsbət, hərəkətsiz, sporalı kokobasillərdir

**42. Brüsellanın insan üçün daha patogen olan növü:**

A) Brucella melitensis

B) Brucella ovis

C) Brucella rangiferi

D) Brucella canis

E) Brucella neotome

**43. Brusellalar üçün optimal kultivasiya mühitidir:**

A) qaraciyərli aqar

B) ödlü bulyon

C) Saburo mühiti

D) ət-peptonlu aqar

E) kazein kömürlü aqar

**44. Brusellaların növdaxili differensiasiyasında istifadə edilir:**

A) hidrogen sulfid əmələ gətirmə

B) karbohidratları parçalama

C) kapsula əmələ gətirmə

D) adi qidalı mühitlərdə inkişaf

E) antibiotiklərə həssaslıq

**45. Brusellalar saxlanılır:**

A) süddə və süd məhsullarında 1-2 ay

B) dondurulmuş ətdə 3-5 gün

C) süddə və süd məhsullarında 1-2 gün

D) dondurulmuş ətdə 3-5 il

E) torpaqda 1-2 il

**46. Brusellozda infeksiya mənbəyidir:**

A) ev heyvanları

B) insanlar

C) ətraf mühit obyektləri

D) gənələr

E) ağcaqanadlar

**47. Brusellozun əsas yoluxma yoludur:**

A) alimentar yol

B) transmissiv yol

C) hava-damcı yolu

D) parenteral yol

E) transplasentar yol

**48. Brusellaların patogenlik amillərinə aiddir:**

A) kapsula və endotoksin

B) kapsula və ekzotoksin

C) endotoksin və ekzotoksin

D) endotoksin və hidrogen sulfid

E) plazmakoaqulaza və hialuronidaza

**49. Bakteriyalar dəri və selikli qişalardan orqanizmə daxil olur, inkubasiya dövrü müddətində regionar limfa düyünlərində çoxalır. Sonra limfa düyünlərindən qan dövranına keçərək qaraciyər, dalaq və sümük iliyində hüceyrə daxilində uzun müddət qalaraq infiltratlarla əhatə olunmuş nekroz ocaqları formalaşdırır, proses xroniki hala**

**keçir. Proses kəskinləşdikdə törədicilər sürətlə çoxalmaqla qan dövranına keçərək təkrar generalizasiya dalğası əmələ gətirir. Göstərilənlər hansı xəstəliyin patogenezini ifadə edir?**

A) bruselloz

B) qarayara

C) səpgili yatalaq

D) qayıdan yatalaq

E) listerioz

**50. Xəstə orqanizmində hüceyrədaxili yerləşir:**

A) brusellalar

B) stafilokoklar

C) borreliyalar

D) Candida cinsli göbələklər

E) mikoplazmalar

**51. Brusellozun klinik əlamətlərinə aiddir:**

A) uzunmüddətli hərarət

B) pnevmoniya

C) pielonefrit

D) dermatit

E) konyuktivit

**52. Brusellozun klinik əlamətlərinə aiddir:**

A) poliartrit

B) pnevmoniya

C) pielonefrit

D) dermatit

E) konyuktivit

**53. Brusellozun diaqnostikasında istifadə *edilmir*:**

A) mikroskopik üsul

B) seroloji üsul

C) bakterioloji üsul

D) bioloji üsul

E) dəri-allerqik üsul

**54. Brusellozun diaqnostikasında istifadə edilir:**

**1.Mikroskopik üsul;**

**2.Rayt reaksiyası;**

**3.İmmunoferment analiz;**

**4.Bürne sınağı;**

**5.Vidal reaksiyası;**

A) 2, 3, 4

B) 1, 2, 3

C) 2, 3, 5

D) 3, 4, 5

E) 2, 4, 5

**55. Brusellozun seroloji diaqnostikasında istifadə edilir:**

A) Rayt reaksiyası

B) Vidal reaksiyası

C) immoblizasiya reaksiyası

D) immunoblottinq

E) radial immunodiffuziya

**56. Brusellozun seroloji diaqnostikasında istifadə edilir:**

A) immunoferment analiz

B) Vidal reaksiyası

C) Vasserman reaksiyası

D) immunoblottinq

E) radial immunodiffuziya

**57. Orta yaşlarında olan kişi 3 həftə davam edən qızdırma və oynaqlarda ağrı şikayətlərilə həkimə müraciət etmişdir. Qan zərdabı ilə Rayt reaksiyasının titri 1:160-dır. Ehtimal edilən xəstəlik:**

A) bruselloz

B) revmatizm

C) Laym xəstəliyi

D) leptospiroz

E) revmatoid artrit

**58. Bruselyozun müalicəsində istifadə edilir:**

A) tetrasiklin və streptomisin

B) penisillin və xloramfenikol

C) flukonazol və metronidazol

D) seftriakson və eritromisin

E) seftriakson və metronidazol

**59. Francisella tularensis:**

A) Qram mənfi, hərəkətsiz, spora əmələ gətirməyən kokobasildir

B) Qram mənfi, hərəkətli, sporalı kokobasildir

C) Qram mənfi, hərəkətli, kapsulalı vergülşəkilli bakteriyadır

D) Qram müsbət, hərəkətli, spora əmələ gətirməyən çöpvari bakteriyadır

E) Qram müsbət, hərəkətsiz, spora əmələ gətirməyən kokobasildir

**60. Tulyaremiya törədiciləri üçün optimal kultivasiya mühitidir:**

A) Frensis mühiti

B) ödlü bulyon

C) Saburo mühiti

D) qaraciyərli aqar

E) kazein kömürlü aqar

**61. Tulyaremiyada infeksiya mənbəyidir:**

A) gəmiricilər

B) insanlar

C) ətraf mühit obyektləri

D) torpaq

E) ağcaqanadlar

**62. Tulyaremiyanın yoluxma yolu *deyil*:**

A) transplasentar

B) təmas

C) aerozol

D) transmissiv

E) alimentar

**63. Francisella tularensis-in patogenlik amillərinə aiddir:**

A) endotoksin

B) ekzotoksin

C) spora

D) plazmakoaqulaza

E) lipoteyxoat turşusu

**64. Bu xəstəlikdən sonra uzunmüddətli, bəzən ömürlük immunitet formalaşır:**

A) tulyaremiya

B) sifilis

C) vərəm

D) bruselloz

E) süzənək

**65. Törədicinin limfa düyünlərinə daxil olması nəticəsində birincili və ikincili bubonların əmələ gəlməsi ilə müşayiət olunan, bubon, ağciyər, abdominal və generalizasiyalı klinik formalara malik təbii ocaqlı zoonoz infeksiyadır:**

A) tulyaremiya

B) endemik səpgili yatalaq

C) endemik qayıdan yatalaq

D) bruselloz

E) listerioz

**66. Tulyaremiyanın birincili bubon forması hansı halda müşahidə edilir?**

A) təmas vasitəsilə yoluxduqda

B) aerozol yolla yoluxduqda

C) alimentar yolla yoluxduqda

D) bütün yollarla yoluxduqda

E) hava-damcı yolu ilə yoluxduqda

**67. Tulyaremiyanın diaqnostikasında tətbiq edilir:**

A) seroloji və allergik üsul

B) mikroskopik və seroloji üsul

C) mikroskopik və bioloji üsul

D) bioloji neytrallaşma reaksiyası

E) radial immunodiffuziya

**68. Tulyaremiyanın seroloji diaqnostikasında tətbiq edilir:**

A) aqqlütinasiya reaksiyası

B) immunoblottinq

C) neytrallaşma reaksiyası

D) presipitasiya reaksiyası

E) Kumbs reaksiyası

**69. Diaqnostik məqsədlə dəri-allergik sınaq tətbiq edilir:**

A) tulyaremiyada

B) sifilisdə

C) quduzluqda

D) göy öskürəkdə

E) vəbada

**70. Tulyaremiyanın müalicəsində seçim preparatıdır:**

A) streptomisin

B) penisillin G

C) antitoksik zərdab

D) immun zərdab

E) immunoqlobulin

**71. Legionellalar:**

A) Qram mənfi, hərəkətli, spora əmələ gətirməyən çöpvari bakteriyalardır

B) Qram mənfi, hərəkətsiz, spora əmələ gətirməyən kokşəkilli bakteriyalardır

C) Qram mənfi, hərəkətli, kapsulalı vergülşəkilli bakteriyalardır

D) Qram müsbət, hərəkətli, spora əmələ gətirən çöpvari bakteriyalardır

E) Qram müsbət, hərəkətsiz, spora əmələ gətirməyən çöpvari bakteriyalardır

**72. Legionella pneumophila kultivasiya edilir:**

A) buferləşdirilmiş kömür-maya ekstraktlı aqarda

B) Saburo mühitində

C) qaraciyərli aqarda

D) ödlü bulyonda

E) kazein kömürlü aqarda

**73. Legionellozda infeksiya mənbəyidir:**

A) su

B) gənələr

C) torpaq

D) gəmiricilər

E) ağcaqanadlar

**74. Sapronoz infeksiyalara aiddir:**

A) legionelloz

B) tulyaremiya

C) difteriya

D) bruselloz

E) leptospiroz

**75. Legionellalar yoluxur:**

A) su aerozolları vasitəsilə

B) təmas yolla

C) parenteral yolla

D) transmissiv yolla

E) süd və süd məhsulları vasitəsilə

**76. Su aerozolları vasitəsilə tənəffüs yollarından daxil olaraq yüksək letallıqla müşayiət olunan ağır gedişli, ocaqlı, yaxud lobar pnevmoniyanın inkişafına səbəb olur:**

A) Legionella pneumophila

B) Haemophilus influenzae

C) Chlamydia psittaci

D) Klebsiella pneumoniae

E) Bordetella pertussis

**77. Legionellozun diaqnostikasında tətbiq edilir:**

A) zəncirvari polimeraza reaksiyası

B) hemaqqlütinasiyanın ləngimə reaksiyası

C) toksinin neytrallaşma reaksiyası

D) bioloji neytrallaşma reaksiyası

E) radial immunodiffuziya

**78. Legionellozun müalicəsində seçim preparatıdır:**

A) eritromisin

B) penisillin G

C) antitoksik zərdab

D) immun zərdab

E) metronidazol

**79. Bacillus anthracis:**

A) Qram müsbət, hərəkətsiz, spora əmələ gətirən çöpvari bakteriyadır

B) Qram müsbət, hərəkətsiz, spora əmələ gətirən kokşəkilli bakteriyadır

C) Qram mənfi, hərəkətli, kapsulalı kokşəkilli bakteriyadır

D) Qram müsbət, hərəkətli, spora əmələ gətirməyən çöpvari bakteriyadır

E) Qram mənfi, hərəkətli, spora əmələ gətirməyən çöpvari bakteriyadır

**80. Qram müsbət, hərəkətsiz, spora əmələ gətirən çöpvari bakteriyadır:**

A) Bacillus anthrasis

B) Corynebacterium diphtheriae

C) Bordetella pertussis

D) Yersinia pestis

E) Brucella melitensis

**81. Bacillus anthrasis kultivasiya edilir:**

A) ət peptonlu aqarda

B) buferləşdirilmiş kömür-maya ekstraktlı aqarda

C) qaraciyərli aqarda

D) ödlü bulyonda

E) kazein kömürlü aqarda

**82. Bərk qidalı mühitlərdə Bacillus anthrasis koloniyaları:**

A) “aslan yalı”, yaxud “meduz başını” xatırladır

B) metal parılaqlığına malik qırmızı rəngdə olur

C) yumurta gözcüyünü xatırladır

D) molyar dişləri xatırladır

E) ətrafı haşiyəli dəsmalı xatırladır

**83. Qram müsbət, hərəkətsiz, spora əmələ gətirən çöpvari streptobakteriyadır. Bərk qidalı mühitlərdə “aslan yalı”, yaxud “meduz başını” xatırladan koloniyalar əmələ gətirir:**

A) Bacillus anthrasis

B) Corynebacterium diphtheriae

C) Bordetella pertussis

D) Yersinia pestis

E) Listeria monocytogenes

**84. Penisillin əlavə edilmiş qidalı mühitlərdə inkişaf etmiş kulturasından hazırlanmış yaxmada sferoplastlar zəncir şəklində yerləşərək boyunbağını xatırladır. Bu xüsusiyyət hansı mikroorqanizm üçün xasdır?**

A) Bacillus anthrasis

B) Corynebacterium diphtheriae

C) Bordetella pertussis

D) Yersinia pestis

E) Listeria monocytogenes

**85. Qarayara törədicisinin patogenlik amillərinə aiddir:**

**1.Kapsula;**

**2.Antraks-toksin;**

**3.Eritrogen toksin;**

**4.Traxeal toksin;**

**5.Protein A;**

A) 1, 2

B) 3, 4

C) 1, 3

D) 4, 5

E) 2, 5

**86. Antraks-toksinin tərkibinə daxildir:**

A) protektiv antigen

B) eritrogen toksin

C) traxeal toksin

D) pertussis toksin

E) kapsula antigeni

**87. Antraks-toksinin tərkibinə daxildir:**

A) letallıq amili

B) eritrogen toksin

C) transfer amil

D) pertussis toksin

E) kapsula antigeni

**88. Antraks-toksinin tərkibinə daxildir:**

A) ödem amili

B) enterotoksin

C) transfer amil

D) pertussis toksin

E) eritrogen toksin

**89. Protektiv antigen sahib hüceyrənin membranında məsamələr əmələ gətirməklə letallıq və ödem amillərinın hüceyrəyə daxil olmasını təmin edir. Göstrilən təsir mexanizmi hansı mikroorqanizmin toksini üçün xasdır?**

A) Bacillus anthrasis

B) Corynebacterium diphtheriae

C) Clostridium botulinum

D) Yersinia pestis

E) Vibrio cholerae

**90. Qarayaranın yoluxma yolu *deyil*:**

A) transmissiv

B) alimentar

C) hava-toz

D) aerogen

E) təmas

**91. Zoonoz infeksiyalara aiddir:**

A) qarayara

B) difteriya

C) dizenteriya

D) qarın yatalağı

E) su çiçəyi

**92. Qarayara üçün doğru mülahizə *deyil*:**

A) infeksiya mənbəyi xəstə insanlardır

B) infeksiya mənbəyi xəstə heyvanlardır

C) xəstəliyin dəri forması daha çox rast gəlinir

D) xəstəliyin bütün formalarında disseminasiya mümkündür

E) yoluxma yolundan asılı olaraq xəstəlik müxtəlif klinik əlamətlərə malik olur

**93. Törədicinin daxil olduğu yerdə əvvəlcə papula, sonra seroz və qanlı möhtəviyyata malik pustula əmələ gəlir. Pustula deşildikdən sonra qara rəngli qaysaqla örtülü yaraya çevrilir. Qaysağın ətrafında qırmızı rəngli infiltrat və ödem müşahidə edilir. Göstərilənlər hansı mikroorqanizmlə törədilmiş xəstəliyin patogenezini ifadə edir?**

A) Bacillus anthrasis

B) Haemophilus ducreyi

C) Borrelia burgdorferi

D) Yersinia pestis

E) Erysipelothrix rhusiopathiae

**94. Qarayaranın dəri forması hansı halda müşahidə edilir?**

A) təmas vasitəsilə yoluxduqda

B) aerozol yolla yoluxduqda

C) alimentar yolla yoluxduqda

D) bütün yollarla yoluxduqda

E) aerogen yolla yoluxduqda

**95. Qarayaranın diaqnostikasında tətbiq *edilmir*:**

A) bioloji neytrallaşma reaksiyası

B) mikroskopik üsul

C) mikroskopik və bioloji üsul

D) seroloji və allergik üsul

E) mikroskopik və bakterioloji üsul

**96. 40 yaşlı qəssabın əlinin arxa səthində qara rəngli qaysaqla örtülü karbunkul əmələ gəlmişdir. Qaysağın ətrafında qırmızı rəngli infiltrat və ödem müşahidə edilir. Karbunkul möhtəviyyatının mikroskopik müayinəsində Qram müsbət çöpvari streptobakteriyalar aşkar edilmişdir. Ehtimal edilən törədici:**

A) Bacillus anthrasis

B) Listeria monocytogenes

C) Borrelia burgdorferi

D) Yersinia pestis

E) Erysipelothrix rhusiopathiae

**97. Qara yaranın spesifik profilaktikasında istifadə edilir:**

A) vaksin

B) antitoksik zərdab

C) immunoqlobulin

D) anatoksin

E) interferon

**98. Qara yaranın müalicəsində tətbiq edilir:**

A) siprofloksasin

B) antitoksik zərdab

C) flukonazol

D) azidotimidin

E) metronidazol

**99. Qida zəhərlənməsi törədir:**

A) Bacillus cereus

B) Borrelia burgdorferi

C) Streptococcus mutans

D) Streptococcus mitis

E) Listeria monocytogenes

**100. Corynebacterium diphtheriae:**

A) Qram müsbət, hərəkətsiz, spora əmələ gətirməyən çöpvari bakteriyadır

B) Qram müsbət, hərəkətsiz, spora əmələ gətirən çöpvari bakteriyadır

C) Qram mənfi, hərəkətli, spora əmələ gətirməyən çöpvari bakteriyadır

D) Qram müsbət, hərəkətsiz, spora əmələ gətirməyən kokşəkilli bakteriyadır

E) Qram mənfi, hərəkətli, spora əmələ gətirən çöpvari bakteriyadır

**101. Qram müsbət, hərəkətsiz, spora əmələ gətirməyən çöpvari bakteriyalardır. Hüceyrələrin daxilində volyutin dənəcikləri aşkar edilir:**

A) korinebakteriyalar

B) brusselallar

C) basillər

D) klostridilər

E) salmonellalar

**102. Corynebacterium cinsinin insan üçün şərti-patogen olan növəri necə adlanır?**

A) difteroidlər

B) listeriyalar

C) basillər

D) klostridilər

E) psevdomonadlar

**103. Qram müsbət, hərəkətsiz, spora əmələ gətirməyən çöpvari bakteriyadır. Hüceyrələrin uclarında volyutin dənəcikləri aşkar edilir. Yaxmalarda açılmış barmaqları, yaxud V, X və L latın hərflərini xatırladan formada yerləşir. Adi qidalı mühtərdə inkişaf etmir:**

A) Corynebacterium diphtheriae

B) Corynebacterium xerosis

C) Streptococcus mutans

D) Bacillus anthrasis

E) Bacillus cereus

**104. Adi qidalı mühtərdə inkişaf edən bu çöpvari bakteriya Qram müsbətdir, spora əmələ gətirmir, hərəkətsizdir, daxilində volyutin dənəcikləri aşkar edilir. Yaxmalarda çox vaxt paralel – çəpər formasında yerləşir:**

A) Corynebacterium xerosis

B) Corynebacterium diphtheriae

C) Streptococcus mitis

D) Bacillus anthrasis

E) Bacillus cereus

**105. Corynebacterium diphtheriae-nın morfoloji differensiasiyası üçün tətbiq edilir:**

A) Neysser üsulu

B) Burri üsulu

C) Gins üsulu

D) Ojeşko üsulu

E) Gimza üsulu

**106. Corynebacterium diphtheriae üçün elektv mühitdir:**

A) Klauberq mühiti

B) Levenşteyn-Yensen mühiti

C) kazein-kömürlü aqar

D) Saburo mühiti

E) Endo mühiti

**107. Corynebacterium diphtheriae-nın qravis biovarı Klauberq mühitində əmələ gətirir:**

A) bozumtul qara rəngli iri ölçülü R-koloniyalar

B) hemoliz zonalı kiçik ölçülü S-koloniyalar

C) metal parlaqlığa malik qırmızı koloniyalar

D) “aslan yalını” xatırladan koloniyalar

E) ətrafı haşiyəli dəsmalı xatırladan koloniyalar

**108. Corynebacterium diphtheriae-nın mitis biovarı Klauberq mühitində əmələ gətirir:**

A) hemoliz zonalı kiçik ölçülü S-koloniyalar

B) bozumtul qara rəngli iri ölçülü R-koloniyalar

C) metal parlaqlığa malik qırmızı koloniyalar

D) “aslan yalını” xatırladan koloniyalar

E) ətrafı haşiyəli dəsmalı xatırladan koloniyalar

**109. Corynebacterium diphtheriae ekzotoksinin təsir mexanizmi:**

A) hüceyrələrdə zülal sintezinin blokadası

B) hüceyrələrdə adenilatsiklaza fermentinin aktivləşməsi

C) hüceyrələrdə siklik-AMF toplanması

D) T-helperlərin poliklonal stimulyasiyası

E) sinapslarda neyromediatorların parçalanması

**110. Corynebacterium diphtheriae ekzotoksinin üçün doğru mülahizədir:**

A) ribosomlarda EF-2 elonqasiya amilini inaktivləşdirir

B) hüceyrələrdə adenilatsiklaza fermentini aktivləşdirir

C) hüceyrələrin sitoplazmatik membranında məsamələr əmələ gətirir

D) T-helperlərin poliklonal stimulyasiyasına səbəb olur

E) sinapslarda neyromediatorların parçalanmasına səbəb olur

**111. Corynebacterium diphtheriae-nın ekzotoksin əmələ gətirməsi əlaqədardır:**

A) lizogeniya ilə

B) kompetentliklə

C) volyutin dənələri ilə

D) dissosiasiya dəyişkənliyi ilə

E) kord-faktorla

**112. Difteriyanın yoluxuma yolu *deyil:***

A) transmissiv

B) hava-toz

C) hava-damcı

D) birbaşa təmas

E) dolayı təmas

**113. İnfeksiyanın giriş qapısında, əsasən əsnək və yuxarı tənəffüs yollarında bozumtul ağ ərpin əmələ gəlməsi ilə müşayiət olunan toksinemik infeksiyadır:**

A) difteriya

B) skarlatina

C) qızılca

D) su çiçəyi

E) paraqrip

**114. İnfeksiyanın giriş qapısında əmələ gələn bozumtul ağ ərp tamponla çətinliklə ayrılır və bu zaman selikli qişada qanaxma baş verir. Bu əlamət hansı xəstəlik üçün xarakterdir?**

A) difteriya

B) kandidoz

C) qrip

D) listeriya

E) skarlatina

**115. Difteriyanın daha çox rast gəlinən klinik forması:**

A) əsnək difteriyası

B) yara difteriyası

C) gözün difteriyası

D) dərinin difteriyası

E) burun difteriyası

**116. Difteriyanın ən təhlükəli fəsadlaşmasıdır:**

A) miokardit

B) konyuktivit

C) dermatit

D) hepatit

E) rinit

**117. Həqiqi inağın törədicisidir:**

A) Corynebacterium diphtheriae

B) Neisseria meningitidis

C) Streptococcus pyogenes

D) Candida albicans

E) Bordetella pertussis

**118. Toksinemiya ilə müşayiət olunur:**

A) difteriya

B) dizenteriya

C) qara yara

D) listeriya

E) skarlatina

**119. Difteriyanın diaqnostikasında istifadə edilir:**

A) bakterioloji üsul

B) bioloji üsul

C) komplementin birləşmə reaksiyası

D) Rayt reaksiyası

E) Kumbs reaksiyası

**120. Corynebacterium diphtheriae toksigenliyini təyin etmək üçün tətbiq edilir:**

A) geldə presipitasiya reaksiyası

B) komplementin birləşmə reaksiyası

C) Kumbs reaksiyası

D) aqqlütinasiya reaksiyası

E) immunoflüoressensiya reaksiyası

**121. Klinik materiallarda Corynebacterium diphtheriae *tox*-genini aşkar etmək üçün tətbiq edilir:**

A) zəncirvari polimeraza reaksiyası

B) koaqqlütinasiya reaksiyası

C) Kumbs reaksiyası

D) immunoblottinq

E) immun lizis reaksiyası

**122. Klinik materiallarda Corynebacterium diphtheriae toksinini aşkar etmək üçün tətbiq edilir:**

A) immunoxromatoqrafik üsul

B) koaqqlütinasiya reaksiyası

C) Elek üsulu

D) geldə presipitasiya reaksiyası

E) immun lizis reaksiyası

**123. Difteriyanın spesifik müalicəsində tətbiq edilir:**

A) antitoksik zərdab

B) anatoksin

C) interferon

D) bakteriofaq

E) adsorbsiya edilmiş vaksin (AGDT)

**124. Difteriyanın spesifik profilaktikasında istifadə edilir:**

A) adsorbsiya edilmiş vaksin (AGDT)

B) BCG vaksini

C) bakteriofaq

D) antitoksik zərdab

E) interferon

**125. Adsorbsiya edilmiş göy öskürək-difteriya-tetanus vaksininin (AGDT) tərkibinə daxildir:**

A) difteriya anatoksini

B) tetanus əleyhinə immun zərdab

C) difteriya əleyhinə immun zərdab

D) pertussis anatoksini

E) göy öskürək əleyhinə immun zərdab

**126. Adsorbsiya edilmiş göy öskürək-difteriya-tetanus vaksininin (AGDT) tətbiqindən sonra yaranır:**

A) difteriya əleyhinə antitoksik immunitet

B) tetanus əleyhinə antibakterial immunitet

C) difteriya əleyhinə antibakterial immunitet

D) göy öskürək əleyhinə antitoksik immunitet

E) göy öskürək əleyhinə anatoksin

**127. Şərti-patogen korinebakteriyalar (difteroidlər) üçün dogru mülahizə *deyil*:**

A) spora əmələ gətirməyən Qram mənfi çöpvari bakteriyalardır

B) opportunist infeksiyalar törədir

C) ətraf mühitdə geniş yayılmışlar

D) orqanizmin normal mikroflorasında rast gəlinir

E) spora əmələ gətirməyən Qram müsbət çöpvari bakteriyalardır

**128. Listeria monocytogenes:**

A) Qram müsbət, hərəkətli, spora əmələ gətirməyən çöpvari bakteriyadır

B) Qram müsbət, hərəkətsiz, spora əmələ gətirən çöpvari bakteriyadır

C) Qram mənfi, hərəkətli, spora əmələ gətirməyən çöpvari bakteriyadır

D) Qram müsbət, hərəkətsiz, spora əmələ gətirməyən kokşəkilli bakteriyadır

E) Qram mənfi, hərəkətli, spora əmələ gətirən çöpvari bakteriyadır

**129. Listeria monocytogenes üçün dogru mülahizə *deyil*:**

A) obliqat anaerobdur

B) adi qidalı mühitlərdə yaxşı inkişaf edir

C) kulturası xarakter pendir suyu, yaxud kəsmik qoxusuna malikdir

D) qanlı aqarda hemoliz əmələ gətirir

E) ətraf mühitdə - suda və torpaqda geniş yayılmışdır

**130. Listeriozun yoluxma yolu *deyil*:**

A) transmissiv

B) alimentar

C) təmas

D) transplasentar

E) aerogen

**131. Listeria monocytogenes-in patogenlik amillərinə aiddir:**

A) internalin

B) ekzotoksin

C) kapsula

D) enterotoksin

E) plazmakoaqulaza

**132. Listeria monocytogenes-in əsas patogenlik amili olan listeriolizin O:**

A) faqolizosomlarının membranını parçalayır

B) faqosomlarda sərbəst oksigen radikalllarını neytrallaşdırır

C) ribosomlarda EF-2 elonqasiya amilini inaktivləşdirir

D) hüceyrələrin sitoplazmatik membranında məsamələr əmələ gətirir

E) sinapslarda neyromediatorların parçalanmasına səbəb olur

**133. Bətndaxili yoluxaraq neonatal sepsis, dölün ölümü, spontan abort və inkişaf anomaliyalarına səbəb olur:**

A) Listeria monocytogenes

B) Chlamydia trachomatis

C) Streptococcus agalactiae

D) Candida albicans

E) Bordetella pertussis

**134. Meningeal əlamətləri olan yenidogulmuş uşağın serebrospinal mayesindən adi qidalı mühitlərdə inkişaf edən, qanlı aqarda zəif hemoliz zonası ilə əhatə olunmuş yarımşəffaf koloniyalar əmələ gətirən Qram müsbət, hərəkətli, spora əmələ gətirməyən çöpvari bakteriya əldə edilmişdir. Ehtimal edilən törədici:**

A) Listeria monocytogenes

B) Neisseria meningitidis

C) Streptococcus pneumoniae

D) Corynebacterium diphtheriae

E) Haemophilus influenzae

**135. Spora əmələ gətirən anaeroblara aiddir:**

A) Clostridium

B) Corynebacterium

C) Listeria

D) Mycobacterium

E) Haemophilus

**136. Clostridium botulinum:**

A) Qram müsbət, anaerob, spora əmələ gətirən, hərəkətli, çöpvari bakteriyadır

B) Qram mənfi, anaerob, spora əmələ gətirməyən, hərəkətli, çöpvari bakteriyadır

C) Qram müsbət, anaerob, spora əmələ gətirməyən, hərəkətsiz, çöpvari bakteriyadır

D) Qram mənfi, aerob, spora əmələ gətirməyən, hərəkətli, çöpvari bakteriyadır

E) Qram müsbət, aerob, spora əmələ gətirməyən, hərəkətsiz, çöpvari bakteriyadır

**137. Qram müsbət, anaerob, spora əmələ gətirən çöpvari bakteriyadır:**

A) Clostridium botulinum

B) Listeria monocytogenes

C) Corynebacterium diphtheriae

D) Haemophilus influenzae

E) Bacillus anthracis

**138. Bu bakteriyada spora subterminal yerləşərək ona xarakter "tennis raketkası" forması verir:**

A) Clostridium botulinum

B) Listeria monocytogenes

C) Corynebacterium diphtheriae

D) Clostridium tetani

E) Bacillus anthracis

**139. Clostridium botulinum üçün kultivasiya mühitidir:**

A) Kitt-Tarotsi mühiti

B) Levenşteyn-Yensen mühiti

C) Klauberq mühiti

D) Saburo mühiti

E) Endo mühiti

**140. Botulizmin əsas yoluxma yoludur:**

A) alimentar

B) transmissiv

C) təmas

D) transplasentar

E) aerogen

**141. Hansı qida məhsullarının qəbulundan sonra botulizmin baş vermə ehtimalı daha yüksəkdir?**

A) konservləşdirilmiş ət və balıq məhsulları

B) konservləşdirilmiş süd və süd məhsulları

C) bişirilməmiş yumurta

D) bişirilməmiş un məmulatları

E) bişirilməmiş süd məhsulları

**142. Clostridium botulinum-un patogenlik amillərinə aiddir:**

A) ekzotoksin

B) endotoksin

C) kapsula

D) flagella

E) plazmakoaqulaza

**143. Botulotoksinin təsir mexanizmi:**

A) sinapslarda neyromediatorların parçalanması

B) hüceyrələrdə adenilatsiklaza fermentinin aktivləşdirilməsi

C) hüceyrələrin osmotik lizisi

D) T-helperlərin poliklonal stimulyasiyası

E) ribosomlarda EF-2 elonqasiya amilinin inaktivləşdirilməsi

**144. Botulotoksinin bioloji təsir effekti:**

A) əzələlərin iflici

B) əzələlərin qıcolması

C) hüceyrələrin nekrozu

D) immunostimulyasiya

E) hüceyrələrin osmotik lizisi

**145. Botulizmin klinik əlamətlərinə aiddir:**

A) sinir-paralitik əlamətlər

B) hemorragik sindrom

C) daxili qanaxma

D) septik endokardit

E) poliartrit

**146. Patoloji materiallarda və qida məhsullarında botulotoksini təyin etmək üçün tətbiq edilir:**

A) bioloji sınaq

B) koaqqlütinasiya reaksiyası

C) Elek üsulu

D) geldə presipitasiya reaksiyası

E) immun lizis reaksiyası

**147. Patoloji materiallarda və qida məhsullarında botulotoksini təyin etmək üçün tətbiq edilir:**

A) neytrallaşma reaksiyası

B) koaqqlütinasiya reaksiyası

C) mikroskopik üsul

D) geldə presipitasiya reaksiyası

E) immun lizis reaksiyası

**148. Botulizmin spesifik profilaktikası məqsədi ilə istifadə edilir:**

A) antitoksik zərdab

B) interferon

C) bakteriofaq

D) immunoqlobulin

E) rekombinant vaksin

**149. Botulizmin spesifik müalicəsində istifadə edilir:**

A) antitoksik zərdab

B) anatoksin

C) adsorbsiya edilmiş vaksin (AGDT)

D) tetrasiklin

E) rekombinant vaksin

**150. Botulizm əleyhinə antitoksik zərdabın tərkibinə daxildir:**

A) Clostridium botulinum əleyhinə antitoksik anticisimlər

B) botulizm anatoksini

C) Clostridium botulinum əleyhinə antibakterial anticisimlər

D) virulentliyi zəifləşdirilmiş Clostridium botulinum

E) botulotoksin geninə malik maya göbələkləri

**151. Clostridium tetani:**

A) Qram müsbət, anaerob, spora əmələ gətirən, hərəkətli, çöpvari bakteriyadır

B) Qram mənfi, anaerob, spora əmələ gətirməyən, hərəkətli, çöpvari bakteriyadır

C) Qram müsbət, anaerob, spora əmələ gətirməyən, hərəkətsiz, çöpvari bakteriyadır

D) Qram mənfi, aerob, spora əmələ gətirməyən, hərəkətli, çöpvari bakteriyadır

E) Qram müsbət, aerob, spora əmələ gətirməyən, hərəkətsiz, çöpvari bakteriyadır

**152. Qram müsbət, anaerob, spora əmələ gətirən çöpvari bakteriyadır:**

A) Clostridium tetani

B) Listeria monocytogenes

C) Corynebacterium diphtheriae

D) Haemophilus influenzae

E) Bacillus anthracis

**153. Bu bakteriyada spora terminal yerləşərək ona xarakter "təbil çubuğu" forması verir:**

A) Clostridium tetani

B) Listeria monocytogenes

C) Corynebacterium diphtheriae

D) Clostridium perfringens

E) Bacillus anthracis

**154. Clostridium tetani üçün kultivasiya mühitidir:**

A) Vilson-Bler mühiti

B) Levenşteyn-Yensen mühiti

C) Klauberq mühiti

D) Saburo mühiti

E) Endo mühiti

**155. Tetanusun əsas yoluxma mexanizmidir:**

A) təmas

B) transmissiv

C) fekal-oral

D) transplasentar

E) aerogen

**156. Clostridium tetani üçün patogenlik amilidir:**

A) ekzotoksin

B) endotoksin

C) kapsula

D) spora

E) keratinaza

**157. Sinirlərə motor neyronların presinaptik membranından daxil olur və aksondaxili retroqrad axınla bu neyronların cisminə gətirilir, daha sonra ləngidici neyronlara təsir göstərir. Göstərilənlər hansı toksinin təsir mexanizmini ifadə edir?**

A) tetanospazmin

B) botulotoksin

C) pertussis toksin

D) xolerogen ekzotoksin

E) antraks toksin

**158. Tetanospazminin təsir mexanizmi:**

A) sinapslarda neyromediatorların ifrazının blokadası

B) hüceyrələrdə adenilatsiklaza fermentinin aktivləşdirilməsi

C) hüceyrələrin osmotik lizisi

D) T-helperlərin poliklonal stimulyasiyası

E) ribosomlarda EF-2 elonqasiya amilinin inaktivləşdirilməsi

**159. Tetanospazminin damar daxilinə yeridilməsi eksperimental heyvanlarda nə ilə nəticələnər?**

A) enən tetanus

B) qalxan tetanus

C) meningoensefalit

D) ishal

E) korluq

**160. Tetanus üçün xarakter *deyil*:**

A) səpgilər

B) qıcolma

C) trizm

D) məcburi gülüş

E) opistonus

**161. Tetanusdan sonra:**

A) immunitet formalaşmır

B) steril immunitet formalaşır

C) qeyri-steril immunitet formalaşır

D) uzunmüddətli immunitet formalaşır

E) antitoksik immunitet formalaşır

**162. Tetanusdan sonra immunitetin *formalaşmamasının* səbəbi:**

A) toksinin toksigen dozasının onun immunogen dozasından az olması

B) toksinin immunogen dozasının onun toksigen dozasından az olması

C) toksinin immunogenliyinin zəif olması

D) toksinin antigenliyinin zəif olması

E) infeksion immunitetin formalaşması

**163. Tetanusun spesifik profilaktikasında istifadə edilir:**

A) adsorbsiya olunmuş vaksin (AGDT)

B) tetanospazmin

C) BCG vaksini

D) tuberkulin

E) bakteriofaq

**164. Adsorbsiya edilmiş göy öskürək-difteriya-tetanus vaksininin (AGDT) tərkibinə daxildir:**

A) tetanus anatoksini

B) tetanus əleyhinə immun zərdab

C) difteriya əleyhinə immun zərdab

D) pertussis anatoksini

E) göy öskürək əleyhinə immun zərdab

**165. Tetanusun spesifik profilaktikasında istifadə edilir:**

A) anatoksin

B) tetanospazmin

C) BCG vaksini

D) tuberkulin

E) bakteriofaq

**166. Tetanusun spesifik profilaktikasında istifadə edilir:**

A) antitoksik zərdab

B) tetanospazmin

C) tetanolizin

D) penisillin G

E) bakteriofaq

**167. Tetanusun spesifik müalicəsində istifadə edilir:**

A) antitoksik zərdab

B) penisillin G

C) metronidazol

D) tetrasiklin

E) interferon

**168. Clostridium perfringens:**

A) Qram müsbət, anaerob, spora əmələ gətirən, hərəkətsiz, çöpvari bakteriyadır

B) Qram mənfi, anaerob, spora əmələ gətirməyən, hərəkətli, çöpvari bakteriyadır

C) Qram müsbət, anaerob, spora əmələ gətirməyən, hərəkətsiz, çöpvari bakteriyadır

D) Qram mənfi, aerob, spora əmələ gətirməyən, hərəkətli, çöpvari bakteriyadır

E) Qram müsbət, aerob, spora əmələ gətirməyən, hərəkətsiz, çöpvari bakteriyadır

**169. Qram müsbət, anaerob, spora və kapsula əmələ gətirən, hərəkətsiz çöpvari bakteriyadır:**

A) Clostridium perfringens

B) Listeria monocytogenes

C) Clostridium tetani

D) Klebsiella pneumoniae

E) Bacillus anthracis

**170. Clostridium perfringens üçün kultivasiya mühitidir:**

A) Kitt-Tarotsi mühiti

B) kazein-kömürlü aqar

C) Klauberq mühiti

D) Saburo mühiti

E) ödlü bulyon

**171. Clostridium perfringens-in patogenlik amilidir:**

A) ekzotoksin

B) endotoksin

C) flagella

D) spora

E) keratinaza

**172. Clostridium perfringens toksininin bioloji təsir effektlərinə aid *deyil:***

A) qıcolma

B) letal təsir

C) nekrotik təsir

D) hemolitik təsir

E) sitotoksik təsir

**173. Clostridium perfringens toksininin lesitinaza aktivliyinə malik fraksyası:**

A) alfa toksin

B) beta toksin

C) teta toksin

D) kappa toksin

E) epsilon toksin

**174. Torpağın sanitar göstəricisi olan bu bakteriya ətraf mühitdə geniş yayılmışdır, heyvanların və insanların bağırsaqlarında rast gəlinir, qazlı qanqrena və qida zəhərlənməsi törədir:**

A) Clostridium perfringens

B) Clostridium hystoliticum

C) Clostridium novyi

D) Clostridium septicum

E) Clostridium difficile

**175. Qazlı qanqrenanın əsas yoluxma mexanizmidir:**

A) təmas

B) transmissiv

C) fekal-oral

D) transplasentar

E) aerogen

**176. Qazlı qanqrenanın diaqnostikasında istifadə edilir:**

A) mikroskopik və bakterioloji üsul

B) seroloji və dəri-allergik üsul

C) bakterioloji və dəri-allergik üsul

D) Rayt və Kumbs reaksiyası

E) geldə presipitasiya reaksiyası

**177. Nekrotik yara ekssudatının mikroskopik müayinəsi nəticəsində iri, hərəkətsiz, kapsulalı Qram müsbət çöpvari bakteriyaların aşkar edilməsi hansı xəstəlikdən şübhələnməyə əsas verir?**

A) qazlı qanqrena

B) tetanus

C) impetiqo

D) yumşaq şankr

E) miqrasiya edən eritema

**178. Qazlı qanqrenanın spesifik profilaktikasında istifadə edilir:**

A) antitoksik zərdab

B) tetanospazmin

C) interferon

D) tuberkulin

E) bakteriofaq

**179. Qazlı qanqrenanın spesifik müalicəsində istifadə edilir:**

A) antitoksik zərdab

B) bakteriofaq

C) anatoksin

D) immunoqlobulin

E) interferon

**180. Clostridium difficile:**

A) Qram müsbət, anaerob, spora əmələ gətirən, hərəkətli, çöpvari bakteriyadır

B) Qram mənfi, anaerob, spora əmələ gətirməyən, hərəkətli, çöpvari bakteriyadır

C) Qram müsbət, anaerob, spora əmələ gətirməyən, hərəkətsiz, çöpvari bakteriyadır

D) Qram mənfi, aerob, spora əmələ gətirməyən, hərəkətli, çöpvari bakteriyadır

E) Qram müsbət, aerob, spora əmələ gətirməyən, hərəkətsiz, çöpvari bakteriyadır

**181. Clostridium difficile üçün kultivasiya mühitidir:**

A) yumurta sarılı fruktozalı aqar

B) kazein-kömürlü aqar

C) yumurta sarılı duzlu aqar

D) Saburo mühiti

E) Middlebrook 7H10 mühiti

**182. Clostridium difficile-nin patogenlik amilidir:**

A) ekzotoksin

B) endotoksin

C) flagella

D) spora

E) keratinaza

**183. Psevdomembranoz kolitin törədicisidir:**

A) Clostridium difficile

B) Shigella dysenteriae

C) Corynebacterium diphtheriae

D) enteroviruslar

E) enteroinvaziv Escherichia coli

**184. Psevdomembranoz kolitin patogenetik meanizmi:**

A) antibiotiklərlə müalicə zəminində bağırsaqların normal mikroflorasının disbalansı

B) antibiotiklərin təsirindən bağırsaqlarda Candida cinsli göbələklərin çoxalması

C) Shigella dysenteriae-nın şiqa-toksini təsirindən bağırsaqların selikli qişasının nekrozu

D) enterovirusların bağırsaq epitelində çoxalması nəticəsində psevdomembrananın formalaşması

E) enteroinvaziv Escherichia coli-nin bağırsaq epitelinə invaziyası

**185. Antibiotik qəbul edən 35 yaşlı kişi müalicənin 12-ci günündə qarında sancışəkilli ağrılar, ishal və qızdırma əlamətlərilə həkimə müraciət etmişdir. Nəcisin mikroskopik**

**müayinəsində iri, Qram müsbət bakteriyalar aşkar edilmiş, rutin bakterioloji müayinədə patogen mikroorqanizm əldə edilməmişdir. Ehtimal edilən xəstəlik:**

A) psevdomembranoz kolit

B) bağırsaqların kandidozu

C) ameb dizenteriyası

D) bakterial dizenteriya

E) qarın yatalağı

**186. Antibiotik qəbul edən 35 yaşlı kişi müalicənin 12-ci günündə qarında sancışəkilli ağrılar, ishal və qızdırma əlamətlərilə həkimə müraciət etmişdir. Nəcisin mikroskopik müayinəsində iri, Qram müsbət bakteriyalar aşkar edilmiş, rutin bakterioloji müayinədə patogen mikroorqanizm müəyyən edilməmişdir. Ehtimal edilən törədici:**

A) Clostridium difficile

B) Shigella dysenteriae

C) Salmonella Enteritidis

D) enteroviruslar

E) rotaviruslar

**187. Psevdomembranoz kolitin diaqnostikasında istifadə edilir:**

A) mikroskopik üsul

B) bioloji üsul

C) toksinin neytrallaşma reaksiyası

D) immunoblottinq

E) həlqə presipitasiya reaksiyası

**188. Psevdomembranoz kolitin müalicəsində istifadə edilir:**

A) metrondazol

B) klindamisin

C) seftriakson

D) ampisillin/sulbaktam

E) amoksisillin/klavulan turşusu

**189. Bakteroidlər:**

A) Qram mənfi, anaerob, spora əmələ gətirməyən çöpvari bakteriyalardır

B) Qram müsbət, anaerob, spora əmələ gətirən çöpvari bakteriyalardır

C) Qram müsbət, anaerob, spora əmələ gətirməyən çöpvari bakteriyalardır

D) Qram mənfi, aerob, spora əmələ gətirməyən çöpvari bakteriyalardır

E) Qram müsbət, aerob, spora əmələ gətirməyən çöpvari bakteriyalardır

**190. Qram mənfi, anaerob, spora əmələ gətirməyən çöpvari bakteriyalara aid *deyil*:**

A) Clostridium cinsi

B) Prevotella cinsi

C) Porphyromonas cinsi

D) Fusobacterium cinsi

E) Bacteroides cinsi

**191. Bacteroides fragilis qrupundan olan və bu qrupdan olmayan bakteroidlərin differensiasiyasında istifadə edilir:**

A) ödün təsirinə davamlılıq testi

B) anaerob şəraitdə inkişaf xarakteri

C) duzlu mühitlərdə inkişaf xarakteri

D) metisillinə davamlılıq testi

E) optoxinə davamlılıq testi

**192. Bacteroides fragilis qrupundan olan bakteroidlərin ekoloji yarusudur:**

A) yoğun bağırsaqlar

B) ağız boşluğu

C) yuxarı tənəffüs yolları

D) dəri səthi

E) aşağı tənəffüs yolları

**193. Vinsent anginasının törədicisidir:**

A) Fusobacterium necroforum

B) Prevotella melaninogenica

C) Porphyromonas gingivalis

D) Staphylococcus aureus

E) Streptococcus pyogenes

**194. Hərəkətsiz, spora və kapsula əmələ gətirməyən, turşuyadavamlı, aerob çöpvari bakteriyalara aiddir:**

A) Mycobacterium cinsi

B) Fusobacterium cinsi

C) Corynebacterium cinsi

D) Clostridium cinsi

E) Escherichia cinsi

**195. Mycobacterium tuberculosis:**

A) aerob, spora əmələ gətirməyən, hərəkətsiz çöpvari bakteriyadır

B) aerob, spora əmələ gətirən, hərəkətsiz çöpvari bakteriyadır

C) anaerob, spora əmələ gətirməyən, hərəkətli çöpvari bakteriyadır

D) aerob, spora əmələ gətirməyən, hərəkətli çöpvari bakteriyadır

E) anaerob, spora əmələ gətirməyən, hərəkətsiz çöpvari bakteriyadır

**196. Mycobacterium tuberculosis-in fərgləndirici kultural xassəsi:**

A) qidalı mühitə tələbkar olmaqla tədricən inkişaf edir

B) qidalı mühitə tələbkar olmayaraq adi qidalı mühitlərdə inkişaf edir

C) qidalı mühitə tələbkar olmaqla tez inkişaf edir

D) qidalı mühitə tələbkar olmayaraq tədricən inkişaf edir

E) hüceyrə kulturalarında tədricən inkişaf edir

**197. Mycobacterium tuberculosis üçün kultivasiya mühitidir:**

A) Levenşteyn-Yensen mühiti

B) Kitt-Tarotsi mühiti

C) Klauberq mühiti

D) qaraciyərli aqar

E) kazein-kömürlü aqar

**198. Mycobacterium tuberculosis üçün kultivasiya mühitləridir:**

**1.Klauberq mühiti;**

**2.Levenşteyn-Yensen mühiti;**

**3.Vilson-Bler mühiti;**

**4.Middlebrook mühiti;**

**5.Kitt-Tarotsi mühiti.**

A) 2, 4

B) 1, 2

C) 2, 3

D) 4, 5

E) 2, 5

**199. Mycobacterium tuberculosis üçün doğru mülahizədir:**

A) Levenşteyn-Yensen mühitində 15-20 gün müddətində inkişaf edir

B) Kitt-Tarotsi mühitini bulandırır və qaz əmələ gətirir

C) Klauberq mühitində 15-20 gün müddətində inkişaf edir

D) qaraciyərli aqarda 3-5 gün müddətində gül kələmini xatırladan koloniyalar əmələ gətirir

E) qanlı aqarda 3-5 gün müddətində civə damlasını xatırladan koloniyalar əmələ gətirir

**200. Mycobacterium tuberculosis-i şərti-patogen mikobakteriyalardan fərqləndirmək üçün istifadə edilir:**

A) niasin sınağı

B) optoxin sınağı

C) ödün təsirinə davamlılıq testi

D) antibiotiklərə həssaslıq testi

E) katalaza sınağı

**201. Mycobacterium tuberculosis-in virulentli ştammları mikrokulturada biri-birilə yapışaraq kəndir, yaxud hörük şəklində yerləşirlər. Bu nə ilə əlaqədardır?**

A) kord faktorun olması ilə

B) kapsulanın olması ilə

C) pililərin olması ilə

D) flagellaların olması ilə

E) protektiv antigenin olması ilə

**202. R.Kox vərəm törədicilərinin 6 həftəlik qliserinli buyon kulturasının filtratını 70$^0$C-də əvvəlki həcminin onda biri qalana qədər buxarlandırılmışdır. Nəticədə:**

A) tuberkulin əldə edilmişdir

B) vərəm mikobakteriyalarının virulentliyi zəifləmişdir

C) vərəm mikobakteriyalarının virulentliyi güclənmişdir

D) kord faktor əldə edilmişdir

E) BCG vaksini əldə edilmişdir

**203. Tuberkulin:**

A) vərəm mikobakteriyalarının hüceyrə komponentidir

B) vərəm mikobakteriyalarının ekzotoksinidir

C) vərəm mikobakteriyalarının hüceyrədən kənar komponentidir

D) vərəm mikobakteriyalarının kapsulasından əldə edilir

E) vərəm mikobakteriyalarının sporasından əldə edilir

**204. Vərəm mikobakteriyalarının hansı hüceyrə komponenti ona antigen xassəsi verməklə ləng tipli yüksək həssaslıq reaksiyası törədir və anticisimlərin produksyasına səbəb olur?**

A) proteinlər

B) lipopolisaxarid

C) lipidlər

D) kapsula

E) flagella

**205. Ətraf mühit amillərinə qarşı davamlı olması ilə fərqlənir:**

A) Mycobacterium tuberculosis

B) Shigella dysenteriae

C) Corynebacterium diphtheriae

D) Bordetella pertussis

E) Escherichia coli

**206. Vərəmin yoluxma yollarına aid *deyil:***

A*)* transmissiv

B) aerogen

C) alimentar

D) transplasentar

E) təmas

**207. Vərəm spesifik iltihabı üçün xarakterdir:**

A*)* qranulomalar

B) irinli iltihab

C) Neqri cisimcikləri

D) plazmatik hüceyrə infiltrasiyası

E) Paşen cisimcikləri

**208. Pnevmoniya əlamətləri olan xəstənin bəlğəminin Sil-Nilsen üsulu ilə boyadılmış yaxmasının mikroskopik müayinəsində turşuyadavamlı çöpvari bakteriyalar aşkar edilmişdir. Ehtimal edilən törədici:**

A) Mycobacterium tuberculosis

B) Klebsiella pneumoniae

C) Legionella pneumophila

D) Bordetella pertussis

E) Streptococcus pneumoniae

**209. Pnevmoniya əlamətləri olan xəstənin bəlğəminin Sil-Nilsen üsulu ilə boyadılmış yaxmasının mikroskopik müayinəsində turşuyadavamlı çöpvari bakteriyalar aşkar edilmişdir. Ehtimal edilən xəstəlik:**

A) vərəm

B) krupoz pnevmoniya

C) legionelloz

D) ornitoz

E) atipik pnevmoniya

**210. Vərəmin diaqnostikasında istifadə *edilmir*:**

A) komplementin birləşmə reaksiyası

B) mikroskopik üsul

C) seroloji üsul

D) dəri-allergik üsul

E) zəncirvari polimeraza reaksiyası

**211. Vərəmin diaqnostikasında istifadə *edilmir*:**

A) hemaqqlütinasiyanın ləngimə reaksiyası

B) mikroskopik üsul

C) bioloji üsul

D) bakterioloji üsul

E) zəncirvari polimeraza reaksiyası

**212. Vərəmin diaqnostikasında istifadə edilir:**

**1.Vidal reaksiyası;**

**2.Mantu sınağı**

**3.Rayt reaksiyası;**

**4.Sil-Nilsen üsulu;**

**5.Fernandes sınağı;**

**6.Prays üsulu;**

A) 2, 4, 6

B) 1, 2, 4

C) 2, 4, 5

D) 1, 4, 6

E) 2, 3, 6

**213. Vərəm törədicilərinin kimyəvi terapevtik preparatlara rezistentliyini təyin etmək üçün istifadə edilir:**

A) zəncirvari polimeraza reaksiyası

B) mikroskopik üsul

C) Mantu sınağı

D) Prays üsulu

E) hemaqqlütinasiyanın ləngimə reaksiyası

**214. Vərəm mikobakteriyalarının KatG genində baş verən mutasiya nə ilə nəticələnər?**

A) izoniazidə davamlılıqla

B) atipik mikobakteriyalarının əmələ gəlməsi ilə

C) turşuyadavamsız formaların əmələ gəlməsi ilə

D) streptomisinə davamlılıqla

E) mikobakteriyalarının məhvi ilə

**215. Vərəm törədicilərinin əldə edilməsi və identifikasiya müddətini 1-2 həftəyə qədər qısaltmağa imkan verir:**

A) Prays üsulu

B) mikroskopik üsul

C) Fernandes sınağı

D) zəncirvari polimeraza reaksiyası

E) Mantu reaksiyası

**216. Mantu sınağı üçün doğru mülahizə *deyil:***

A) vərəmlə yoluxmamış insanlarda müsbət olur

B) vərəmlə yanaşı gedən immun çatışmazlıq hallarında mənfi olur

C) BCG vaksinasiyasından sonra müsbət olur

D) vərəmlə yoluxmuş insanlarda müsbət olur

E) ilkin infeksiyanın aktivləşməsi nəticəsində xəstəliyin baş vermə ehtimalını göstərir

**217. Mantu sınağı üçün doğru mülahizədir:**

A) vərəmlə yoluxmamış insanlarda mənfi olur

B) vərəmli xəstələrdə həmişə müsbət olur

C) BCG vaksinasiyasından sonra mənfi olur

D) vərəmlə yoluxmuş insanlarda həmişə mənfi olur

E) müsbət sınaq bütün hallarda aktiv infeksiyanı göstərir

**218. Vərəmin müasir standart kimyəvi terapiyasında istifadə *edilmir*:**

A) tetrasiklin

B) izoniazid

C) pirazinamid

D) rifampisin

E) etambutol

**219. Vərəmin spesifik profilaktikasında tətbiq edilir:**

A) BCG vaksini

B) adsorbsiya edilmiş vaksin (ADT)

C) adsorbsiya edilmiş vaksin (AGDT)

D) öldürülmüş vaksin

E) anatoksin

**220. Mycobacterium tuberculosis-i Mycobacterium bovis-dən fərqləndirmək üçün istifadə edilir:**

A) niasin sınağı

B) optoxin sınağı

C) ödün təsirinə davamlılıq testi

D) antibiotiklərə həssaslıq testi

E) katalaza sınağı

**221. Mycobacterium bovis üçün doğru mülahizə *deyil:***

A) atipik mikobakteriyalara aiddir

B) vərəmin törədicisidir

C) morfologiyasına görə Mycobacterium tuberculosis ilə oxşardır

D) kultural xassələrinə görə Mycobacterium tuberculosis ilə oxşardır

E) əsasən alimentar yolla yoluxur

**222. Atipik mikrobakteriyalara aid *deyil*:**

A) Mycobacterium africanum

B) Mycobacterium scorfulaceum

C) Mycobacterium avium-intracellulare complex

D) Mycobacterium smegmatis

E) Mycobacterium kansasii

**223. Atipik mikrobakteriyalar təsnif edilir:**

A) piqment əmələ gətirməsinə və inkişaf sürətinə görə

B) morfoloji əlamətlərinə görə

C) infeksiya mənbəyinə görə

D) kimyəvi terapevtik preparatlara davamlılığına görə

E) mikol turşusu və mumabənzər maddələrin olmasına görə

**224. Mycobacterium leprae:**

A) spora əmələ gətirməyən, hərəkətsiz çöpvari bakteriyadır

B) spora əmələ gətirən, hərəkətsiz çöpvari bakteriyadır

C) spora əmələ gətirməyən, hərəkətli çöpvari bakteriyadır

D) spora əmələ gətirməyən, hərəkətsiz kokşəkilli bakteriyadır

E) spora əmələ gətirməyən, hərəkətli qıvrım bakteriyadır

**225. Mycobacterium leprae üçün xarakterdir:**

A) turşiya və spirtə davamlıdır

B) monotrix flagellalara malikdir

C) hüceyrə divarı yoxdur

D) psevdomiseli əmələ gətirir

E) adi qidalı mühitlərdə inkişaf edir

**226. Mycobacterium leprae üçün fərgləndirici xüsusiyyətdir:**

A) qidalı mühitlərdə inkişaf etmir

B) qidalı mühitə tələbkar olmayaraq adi qidalı mühitlərdə inkişaf edir

C) qidalı mühitə tələbkar olmaqla tez inkişaf edir

D) qidalı mühitə tələbkar olmayaraq tədricən inkişaf edir

E) qidalı mühitə tələbkar olmaqla tədricən inkişaf edir

**227. Mycobacterium leprae kultivasiya edilir:**

A) armadillərin orqanizmində

B) bitlərin orqanizmində

C) moskit milçəklərinin orqanizmində

D) ağcaqanadların orqanizmində

E) adadovşanlarının orqanizmində

**228. Cüzam xəstəliyində infeksiya mənbəyidir:**

A) xəstə insanlar

B) armadillər

C) xəstə heyvanlar

D) moskit milçəkləri

E) ətraf mühit obyektləri

**229. Cüzam xəstəliyi yoluxur:**

A) təmas və hava-damcı yolu ilə

B) fekal-oral mexanizmlə

C) transmissiv yolla

D) qida və su yolu ilə

E) hava-damcı və fekal-oral mexanizmlə

**230. Cüzam xəstəliyi üçün doğru mülahizədir:**

A) normal immuniteti olan şəxslərdə tuberkuloid forma inkişaf edir

B) normal immuniteti olan şəxslərdə lepromatoz forma inkişaf edir

C) fekal-oral mexanizmlə yoluxur

D) infeksiya mənbəyi ətraf mühit obyektləridir

E) insandan insana yoluxmur

**231. Cüzam xəstəliyi üçün doğru mülahizədir:**

A) zəif rezistentliyə malik olan şəxslərdə lepromatoz forma inkişaf edir

B) zəif rezistentliyə malik olan şəxslərdə tuberkuloid forma inkişaf edir

C) fekal-oral mexanizmlə yoluxur

D) infeksiya mənbəyi ətraf mühit obyektləridir

E) insandan insana yoluxmur

**232. Cüzam xəstəliyinin tuberkuloid formasında periferik nevritlər və anesteziya nə ilə əlaqədardır?**

A) törədicinin lemmositlərdə çoxalması ilə

B) törədicinin sinir hüceyrələrində çoxalması ilə

C) meninqoensefalitlə

D) törədicinin hüceyrə komponentlərinin sinir hüceyrələrinə toksik təsiri ilə

E) törədicinin presinaptik membranı parşçalaması ilə

**233. Dəri və selikli qişalarda anestetik düyünlərin əmələ gəlməsi və periferik nevritlər müşahidə edilir:**

A) cüzamda

B) sifilisdə

C) revmatizmdə

D) zöhrəvi limfaqranulomada

E) aktinomikozda

**234. Cüzamın diaqnostikasında istifadə edilir:**

A) mikroskopik üsul

B) bakterioloji üsul

C) Rayt reaksiyası

D) Vidal reaksiyası

E) Mantu sınağı

**235. Cüzamın diaqnostikasında istifadə edilir:**

A) Fernandes reaksiyası

B) bakterioloji üsul

C) Rayt reaksiyası

D) Vidal reaksiyası

E) Mantu sınağı

**236. Cüzamın müalicəsində istifadə edilir:**

A) dapson

B) izoniazid

C) biseptol

D) metronidazol

E) penisillin G

**237. Aktinomisetlər:**

A) Qram müsbət, spora əmələ gətirən, hərəkətsiz çöpvari bakteriyalardır

B) Qram mənfi, spora əmələ gətirməyən, hərəkətsiz çöpvari bakteriyalardır

C) Qram müsbət, spora əmələ gətirməyən, hərəkətli çöpvari bakteriyalardır

D) Qram mənfi, spora əmələ gətirməyən, hərəkətli çöpvari bakteriyalardır

E) Qram mənfi, spora əmələ gətirən, hərəkətsiz çöpvari bakteriyalardır

**238. Qram müsbət, spora əmələ gətirən, hərəkətsiz çöpvari bakteriyalardır. İnkişaf prosesində bölünmədən sonra onlar bir-birindən ayrılmır, nəticədə şaxələnmiş miseliyəbənzər strukturlar əmələ gətirir:**

A) aktinomisetlər

B) göbələklər

C) mikobakteriyalar

D) mikoplazmalar

E) basillər

**239. Aktinomisetlər üçün xarakterdir:**

A) miseli əmələ gətirmə

B) peritrix flagellalar

C) formalaşmış nüvə

D) kapsula əmələ gətirmə

E) hüceyrə divarının olmaması

**240. Selikli qişalardan və zədələnmiş dəridən toxumalara daxil olan törədicilərin ətrafında spesifik qranuloma formalaşır, sonradan bu qranulomalar irinli və fibroz ocaqlar əmələ gətirməklə parçalanır, patoloji proses nahiyyəsini xarici mühitlə birləşdirən və irinin xaric olmasına imkan verən yollar əmələ gəlir. Göstərilənlər hansı xəstəliyin patogenezini ifadə edir?**

A) aktinomikoz

B) vərəm

C) zöhrəvi limfaqranuloma

D) cüzam

E) qara yara

**241. Aktinomikoz üçün doğru mülahizə *deyil:***

A) transmissiv yolla yoluxur

B) endogen infeksiya kimi təzahür edə bilər

C) ekzogen infeksiya kimi təzahür edə bilər

D) xroniki qranulomatoz infeksiyadır

E) dəri və selikli qişaların səthinə açılan irinin içərisində druzlar aşkar edilir

**242. Dəri və selikli qişaların səthinə açılan irinin içərisində druzların aşkar edilməsi hansı xəstəlik üçün xarakterdir?**

A) aktinomikoz

B) qara yara

C) vərəm

D) cüzam

E) yumşaq şankr

**243. Aktinomikozun diaqnostikasında tətbiq edilir:**

A) mikroskopik üsul

B) seroloji üsul

C) bioloji üsul

D) immunoferment analiz

E) presipitasiya reaksiyası

**244. Aktinomikozun diaqnostikasında tətbiq edilir:**

A) bakterioloji üsul

B) seroloji üsul

C) bioloji üsul

D) Askoli reaksiyası

E) Fernandes reaksiyası

**245. Aktinomikozun müalicəsində istifadə edilir:**

A) pensillin G

B) flukonazol

C) albendazol

D) asiklovir

E) nistatin

**246. İnsan orqanizminin normal mikroflorasına aid *deyil*:**

A) nokardiyalar

B) aktinomisetlər

C) streptokoklar

D) Neisseria cinsindən olan bakteriyalar

E) bakteroidlər

**247. Nokardiyalar:**

A) substrat və hava miselilərinə malik bakteriyalardır

B) substrat və hava miselilərinə malik göbələklərdir

C) eukariot mikroorqanizmlərdir

D) insan orqanizminin normal mikroflorasına daxildirlər

E) qidalı mühitlərdə inkişaf etmirlər

**248. Nokardiyaların ekologiyası:**

A) ətraf mühit obyektləri

B) insan

C) otyeyən heyvanlar

D) ətyeyən heyvanlar

E) quşlar

**249. Nokardiozlar zamanı zədələnir:**

A) ag ciyər və dərialtı toxumalar

B) qaraciyər

C) mədə-bağırsaq traktı

D) sidik yolları

E) tüklər və dırnaqlar

**250. Nocardia asteroides infeksiyalarında patoloji proses lokalizasiya olunur:**

A) ag ciyərlərdə

B) qaraciyərdə

C) mədə-bağırsaq traktında

D) böyrəklərdə

E) tüklərdə və dırnaqlarda

**251. Nocardia brasiliensis infeksiyalarında patoloji prosesin lokalizasiyası:**

A) dərialtı toxumalar

B) qaraciyər

C) mədə-bağırsaq traktı

D) böyrəklər

E) tüklər və dırnaqlar

**252. Nokardiozların diaqnostikasında tətbiq edilir:**

A) mikroskopik və bakterioloji üsul

B) bakterioloji və seroloji üsul

C) seroloji və bioloji üsul

D) Monteneqro sınağı

E) Frey sınağı

**253. Nokardiozun müalicəsində istifadə edilir:**

A) sulfometaksozol trimetoprim

B) flukonazol

C) albendazol

D) asiklovir

E) ornidazol

**254. Sifilisin törədicisidir:**

A) Treponema pallidum

B) Nocardia brasiliensis

C) Haemophilus ducreyi

D) Neisseria gonorrhoeae

E) Chlamydia trachomatis

**255. Treponema pallidum:**

A) qıvrım, hərəkətli, spora əmələ gətirməyən mikroorqanizmdir

B) qıvrım, hərəkətsiz, spora əmələ gətirməyən mikroorqanizmdir

C) qıvrım, hərəkətli, spora əmələ gətirən mikroorqanizmdir

D) çöpvari, hərəkətsiz, spora əmələ gətirməyən mikroorqanizmdir

E) kokabənzər, hərəkətsiz, spora əmələ gətirməyən mikroorqanizmdir

**256. 8-12 ədəd bərabər qıvrıma malik, hərəkətli mikroorqanizmdir:**

A) Treponema

B) Borrelia

C) Leptospira

D) Campylobacter

E) Helicobacter

**257. Treponema pallidum:**

A) Gimza üsulu ilə solğun cəhrayı rəngə boyanır

B) Gimza üsulu ilə göy-bənövşəyi rəngə boyanır

C) Sil-Nilsen üsulu ilə qırmızı rəngə boyanır

D) Sil-Nilsen üsulu ilə solğun cəhrayı rəngə boyanır

E) Neysser üsulu ilə göy-bənövşəyi rəngə boyanır

**258. Treponema pallidum-un virulentli ştammları:**

A) qidalı mühitlərdə inkişaf etmir

B) Klauberq mühitində kultivasiya edilir

C) Levenşteyn-Yensen mühitində kultivasiya edilir

D) Kitt-Tarotsi mühitinində kultivasiya edilir

E) qanlı aqarda kultivasiya edilir

**259. Treponema pallidum-un patogenlik amilidir:**

A) aktiv hərəkət

B) ekzotoksin

C) kapsula

D) nukleoid

E) mikol turşusu

**260. Sifilis yoluxur:**

A) təmas mexanizmi ilə

B) hava-damcı mexanizmi ilə

C) transmissiv mexanizmlə

D) fekal-oral mexanizmlə

E) alimentar yolla

**261. Treponema pallidum orqanizmə daxil olur:**

A) dəri və selikli qişalardan

B) tənəffüs yollarından

C) mədə-bağırsaq traktından

D) tüklərdən

E) dırnaqlardan

**262. Sifilisin birinci dövrü üçün xarakterdir:**

A) bərk şankr

B) yumşaq şankr

C) qummalar

D) səpgilər

E) şankroid

**263. Bərk şankrın patogenetik mexanizmi:**

A) reaktiv vaskulit nəticəsində kapillyarların tıxanması hesabına epitel hüceyrələrinin məhvi

B) T-limfositlərin epitel hüceyrıələrinə sitotoksik təsiri

C) zədələnmiş epitel hüceyrələrinin makrofaqlar tərəfindən udulması

D) treponemaların epitel hüceyrələrinə birbaşa təsiri nəticəsində onların məhvi

E) treponemaların təsirindən induksiya olunan reaginlərin epitel hüceyrələrinə təsiri

**264. Sifilisin ikinci dövrü üçün xarakterdir:**

A) səpgilər

B) yumşaq şankr

C) bərk şankr

D) qummalar

E) şankroid

**265. Sifilisin üçüncü dövrü üçün xarakterdir:**

A) qummalar

B) yumşaq şankr

C) bərk şankr

D) səpgilər

E) şankroid

**266. Sifilisin hansı dövrü yoluxucudur?**

A) birinci və ikinci dövrlər

B) ikinci və üçüncü dövrlər

C) üçüncü və dördüncü dövrlər

D) bütün dövrlər

E) ancaq birinci dövr

**267. Anadangəlmə sifilis üçün doğru mülahizə *deyil*:**

A) doğuş yollarından yoluxma nəticəsində baş verir

B) transplasentar yoluxma nəticəsində baş verir

C) sifilisin ikinci dövrünün əlamətlərilə müşayiət olunur

D) Hetçinson triadası müşahidə edilə bilər

E) bətndaxili yoluxma ölüdoğulma və abortlara səbəb ola bilər

**268. Sifilis zamanı yaranan immunitet üçün doğru mülahizə *deyil*:**

A) təkrar xəstələnmələr müşahidə edilmir

B) təkrar xəstələnmələr zamanı bərk şankr müşahidə edilmir

C) təkrar xəstələnmələr zamanı xəstəlik ikinci dövrün əlamətlərilə başlayır

D) xəstəliyin aktiv dövrlərində superinfeksiya mümükün deyil

E) latent sifilisdə superinfeksiya mümükün deyil

**269. Sifilisin diaqnstikasında istifadə olunur:**

A) mikroskopik və seroloji üsul

B) bakterioloji və seroloji üsul

C) seroloji və bioloji üsul

D) mikroskopik və bakterioloji üsul

E) seroloji və dəri-allergik üsul

**270. Sifilisin birinci dövründə istifadə edilən diaqnostik üsuldur:**

A) mikroskopik

B) bakterioloji

C) mikroskopik və bioloji

D) seroloji və dəri-allergik

E) mikroskopik və bakterioloji

**271. Şankr möhtəviyyatında solğun treponemaları mikroskopik aşkar etmək üçün istifadə edilir:**

A) qaranlıq sahəli mikroskopiya

B) Qram üsulu ilə boyama

C) Neysser üsulu ilə boyama

D) Gins üsulu ilə boyama

E) Leffler ilə boyama

**272. Sifilisin diaqnostikasında qeyri-treponemal anticisimləri aşkar etmək üçün istifadə edilir:**

**1.Dolayı immunoflüoessensiya reaksiyası;**

**2.Passiv hemaqqlütinasiya reaksiyası;**

**3.İmmunoelektroforez;**

**4.VDRL-test;**

**5.RPR-test;**

A) 4, 5

B) 1, 3

C) 3, 4

D) 3, 5

E) 2, 4

**273. Sifilisin seroloji diaqnostikasında treponemal anticisimləri aşkar etmək üçün istifadə edilir:**

**1.Dolayı immunoflüoessensiya reaksiyası;**

**2.RPR-test;**

**3.İmmunoelektroforez;**

**4.VDRL-test;**

**5.Passiv hemaqqlütinasiya reaksiyası;**

A) 1, 5

B) 1, 3

C) 3, 4

D) 4, 5

E) 2, 4

**274. RPR (rapid plasma reagin)-test müsbət nəticə vermiş şəxsdə sifilisin diaqnozunu təsdiq etmək üçün istifadə edilir:**

A) passiv hemaqqlütinasiya reaksiyası vasitəsilə qan zərdabında anticisimlər tədqiq edilir

B) VDRL-test vasitəsilə qan zərdabında anticisimlər tədqiq edilir

C) törədicini aşkar etmək üçün xəstənin qanının bakterioloji müayinəsi aparılır

D) törədicini aşkar etmək üçün xəstənin qanı qaranlıq sahəli mikroskopiya ilə tədqiq edilir

E) törədicini aşkar etmək üçün xəstənin qanı immunoflüoessensiya reaksiyası ilə tədqiq edilir

**275. Sifilisin müalicəsində tətbiq edilir:**

A) penisillin G

B) immun zərdab

C) anatoksin

D) öldürülmüş vaksin

E) autovaksin

**276. Qayıdan yatalağın törədicisidir:**

A) Borrelia

B) Treponema

C) Nocardia

D) Neisseria

E) Chlamydia

**277. Borrelia recurrentis:**

A) qıvrım, hərəkətli, spora əmələ gətirməyən mikroorqanizmdir

B) qıvrım, hərəkətsiz, spora əmələ gətirməyən mikroorqanizmdir

C) qıvrım, hərəkətli, spora əmələ gətirən mikroorqanizmdir

D) çöpvari, hərəkətsiz, spora əmələ gətirməyən mikroorqanizmdir

E) kokabənzər, hərəkətsiz, spora əmələ gətirməyən mikroorqanizmdir

**278. 3-10 ədəd iri, qeyri-bərabər qıvrıma malik, hərəkətli mikroorqanizmdir:**

A) Borrelia

B) Treponema

C) Leptospira

D) Campylobacter

E) Helicobacter

**279. Borreliyalar:**

A) Gimza üsulu ilə göy-bənövşəyi rəngə boyanır

B) Gimza üsulu ilə solğun cəhrayı rəngə boyanır

C) Sil-Nilsen üsulu ilə qırmızı rəngə boyanır

D) Sil-Nilsen üsulu ilə solğun cəhrayı rəngə boyanır

E) Neysser üsulu ilə göy-bənövşəyi rəngə boyanır

**280. Borreliyalar kultivasiya edilir:**

A) toyuq embrionlarında

B) Klauberq mühitində

C) Levenşteyn-Yensen mühitində

D) Kitt-Tarotsi mühitinində

E) kazein-kömürlü aqarda

**281. Borreliyaların törətdiyi xəstəliklərdir:**

**1.Epidemik qayıdan yatalaq;**

**2.Epidemik səpgili yatalaq;**

**3.Endemik qayıdan yatalaq;**

**4.Endemik səpgili yatalaq;**

**5.Laym xəstəliyi;**

**6.Brill-Zinsser xəstəliyi;**

A) 1, 3, 5

B) 1, 3, 4

C) 2, 4, 6

D) 1, 2, 3

E) 2, 3, 4

**282. Borrelia recurrentis törədir:**

A) epidemik qayıdan yatalaq

B) endemik qayıdan yatalaq

C) epidemik səpgili yatalaq

D) endemik səpgili yatalaq

E) Laym xəstəliyi

**283. Epidemik qayıdan yatalaqda infeksiya mənbəyidir:**

A) xəstə insan

B) gəmiricilər

C) gənələr

D) bitlər

E) moskit milçəkləri

**284. Epidemik qayıdan yatalağın yoluxma mexanizmi haqqında doğru mülahizədir:**

A) yoluxmuş bitlərin hemolimfasının zədələnmiş dəriyə sürtülməsi

B) yoluxmuş bitlərin fekalisinin zədələnmiş dəriyə sürtülməsi

C) yoluxmuş ağcaqanadların qan sorması

D) yoluxmuş gənələrin qan sorması

E) yoluxmuş moskit milçəklərinin qan sorması

**285. Endemik qayıdan yatalağın törədicisidir:**

A) Borrelia duttoni

B) Borrelia recurrentis

C) Rickettsia prowazekii

D) Rickettsia typhi

E) Coxiella burnetii

**286. Endemik qayıdan yatalaqda infeksiya mənbəyidir:**

A) gəmiricilər

B) xəstə insan

C) gənələr

D) bitlər

E) birələr

**287. Endemik qayıdan yatalağı yoluxdurur:**

A) gənələr

B) ağcaqanadlar

C) moskit milçəkləri

D) sese milçəyi

E) taxtabitilər

**288. Qayıdan yatalağın əsas klinik əlamətidir:**

A) qızdırma tutmaları

B) atipik pnevmoniya

C) makulopapulyoz səpgilər

D) xoralı kolit

E) miqrasiya edən eritema

**289. Qayıdan yatalağın mikrobioloji diaqnostikası əsaslanır:**

A) Gimza üsulu ilə boyadılmış qan yaxmalarının mikroskopiyasına

B) hemokulturanın alınmasına

C) Gimza üsulu ilə boyadılmış səpgi elementlərinin mikroskopiyasına

D) likvordan törədicilərin kulturasının alınmasına

E) bəlğəmdən hazırlanmış və Gimza üsulu ilə boyadılmış yaxmaların mikroskopiyasına

**290. Laym xəstəliyinin törədicisidir:**

A) Borrelia burgdorferi

B) Borrelia recurrentis

C) Borrelia duttoni

D) Borrelia persica

E) Coxiella burnetii

**291. Laym xəstəliyi üçün doğru mülahizədir:**

A) infeksiya mənbəyi gəmiricilərdir, gənələr vasitəsilə yoluxur

B) infeksiya mənbəyi xəstə insanlardır, gənələr vasitəsilə yoluxur

C) infeksiya mənbəyi gəmiricilərdir, moskit milçəkləri vasitəsilə yoluxur

D) infeksiya mənbəyi xəstə insanlardır, birələr vasitəsilə yoluxur

E) infeksiya mənbəyi xəstə insanlardır, hava-damcı vasitəsilə yoluxur

**292. Laym xəstəliyinin əsas klinik əlamətlərindəndir:**

A) miqrasiya edən eritema

B) atipik pnevmoniya

C) makulopapulyoz səpgilər

D) xoralı kolit

E) qızdırma tutmaları

**293. Miqrasiya edən eritema müşahidə edilir:**

A) Laym xəstəliyində

B) endemik qayıdan yatalaqda

C) epidemik səpgili yatalaqda

D) endemik səpgili yatalaqda

E) Brill-Zinsser xəstəliyində

**294. Leptospira interrogans:**

A) qıvrım, hərəkətli, spora əmələ gətirməyən mikroorqanizmdir

B) qıvrım, hərəkətsiz, spora əmələ gətirməyən mikroorqanizmdir

C) qıvrım, hərəkətli, spora əmələ gətirən mikroorqanizmdir

D) çöpvari, hərəkətsiz, spora əmələ gətirməyən mikroorqanizmdir

E) kokabənzər, hərəkətsiz, spora əmələ gətirməyən mikroorqanizmdir

**295. 20-40 qıvrımdan ibarət hərəkətli mikroorqanizmdir:**

A) Leptospira

B) Treponema

C) Borrelia

D) Campylobacter

E) Helicobacter

**296. Leptospiralar kultivasiya edilir:**

A) zərdab əlavə edilmiş maye qidalı mühitlərdə

B) Kitt-Tarotsi mühitinində

C) qlükoza əlavə edilmiş maye qidalı mühitlərdə

D) kazein-kömürlü aqarda

E) qliserinli bulyonda

**297. Leptospiroz üçün doğru mülahizədir:**

A) infeksiya mənbəyi xəstə heyvanlardır, təmas vasitəsilə yoluxur

B) infeksiya mənbəyi xəstə insanlardır, ağcaqanadlar vasitəsilə yoluxur

C) infeksiya mənbəyi xəstə heyvanlardır, moskit milçəkləri vasitəsilə yoluxur

D) infeksiya mənbəyi xəstə heyvanlardır, bitlər vasitəsilə yoluxur

E) infeksiya mənbəyi xəstə insanlardır, hava-damcı vasitəsilə yoluxur

**298. Leptospiroz üçün doğru mülahizə *deyil*:**

A) infeksiya mənbəyi xəstə heyvanlardır, bitlər vasitəsilə yoluxur

B) infeksiya mənbəyi xəstə heyvanlardır, təmas vasitəsilə yoluxur

C) xəstə heyvanlar törədiciləri sidiklə xaric edirlər

D) insanlar xəstə heyvanların ekskrementləri ilə çirklənmiş su ilə təmas nəticəsində yoluxurlar

E) infeksiyanın giriş qapısı zədələnmiş dəri və selikli qişalardır

**299. Leptospirozun klinik əlamətlərinə aid *deyil*:**

A) makulopapulyoz səpgilər

B) sarılıq

C) aseptik meningit

D) nefrit

E) dalğavari qızdırma

**300. Leptospirozun mikrobioloji diaqnostikasında tətbiq edilir:**

A) Gimza üsulu ilə boyadılmış qan yaxmalarının mikroskopiyası

B) bəlğəmdən hazırlanmış və Gimza üsulu ilə boyadılmış yaxmaların mikroskopiyası

C) Gimza üsulu ilə boyadılmış səpgi elementlərinin mikroskopiyası

D) yara möhtəviyyatından hazırlanmış yaxmaların mikroskopiyası

E) bəlğəmdən hazırlanmış və Sil-Nilsen üsulu ilə boyadılmış yaxmaların mikroskopiyası

**301. Leptospirozun mikrobioloji diaqnostikası üçün doğru mülahizə *deyil*:**

A) bəlğəmdən, yaxud bronx yuyuntusundan törədicinin kulturasının əldə edilməsi

B) sidik, yaxud likvordan törədicinin kulturasının əldə edilməsi

C) qandan hazırlanmış "əzilən damla" preparatının qaranlıq sahəli mikroskopiyası

D) Gimza üsulu ilə boyadılmış qan yaxmalarının mikroskopiyası

E) qandan törədicinin kulturasının əldə edilməsi

**302. Leptospirozun mikrobioloji diaqnostikasında tətbiq *edilmir*:**

A) dəri-allergik üsul

B) mikroskopik üsul

C) bakterioloji üsul

D) seroloji üsul

E) bioloji üsul

**303. Xəstənin qanından hazırlanmış "əzilən damla" preparatının qaranlıq sahəli mikroskopiyası hansı xəstəliyin diaqnostikasında istifadə edilə bilər?**

A) leptospiroz

B) sifilis

C) səpgili yatalaq

D) qarın yatalağı

E) qara yara

**304. Leptospirozun müalicəsində tətbiq edilir:**

A) penisillin G

B) immun zərdab

C) metronidazol

D) antitoksik zərdab

E) azidotimidin

**305. Rikketsiyaların törətdiyi xəstəliklərdir:**

**1.Epidemik qayıdan yatalaq;**

**2.Epidemik səpgili yatalaq;**

**3.Endemik qayıdan yatalaq;**

**4.Endemik səpgili yatalaq;**

**5.Laym xəstəliyi;**

**6.Brill-Zinsser xəstəliyi;**

A) 2, 4, 6

B) 1, 3, 4

C) 1, 3, 5

D) 1, 2, 3

E) 2, 3, 4

**306. Epidemik səpgili yatalağın törədicisidir:**

A) Rickettsia prowazekii

B) Treponema pallidum

C) Borrelia burgdorferi

D) Coxiella burnetii

E) Borrelia recurrentis

**307. Rickettsia prowazekii:**

A) hərəkətsiz, spora əmələ gətirməyən kokabənzər mikroorqanizmdir

B) hərəkətli, spora əmələ gətirməyən çöpvari mikroorqanizmdir

C) hərəkətli, spora əmələ gətirməyən qıvrım mikroorqanizmdir

D) hərəkətsiz, spora əmələ gətirən çöpvari mikroorqanizmdir

E) hərəkətli, spora əmələ gətirməyən kokabənzər mikroorqanizmdir

**308. Rikketsiyaların patogenlik amillərinə aid *deyil*:**

A) ekzotoksin

B) lipopolisaxarid

C) pili

D) Omp-protein

E) mikrokapsula

**309. Rikketsiozlar zamanı hansı hüceyrələrin zədələnməsi xarakterdir?**

A) endotel hüceyrələri

B) saya əzələ hüceyrələri

C) eninəzolaqlı əzələ hüceyrələri

D) tosqun hüceyrələr

E) fibroblastlar

**310. Epidemik səpgili yatalaq üçün doğru mülahizədir:**

A) infeksiya mənbəyi xəstə insanlardır, bitlər vasitəsilə yoluxur

B) infeksiya mənbəyi xəstə insanlardır, ağcaqanadlar vasitəsilə yoluxur

C) infeksiya mənbəyi xəstə heyvanlardır, moskit milçəkləri vasitəsilə yoluxur

D) infeksiya mənbəyi xəstə quşlardır, hava-damcı və hava-toz yolu ilə yoluxur

E) infeksiya mənbəyi xəstə insanlardır, fekal-oral mexanizmlə yoluxur

**311. Epidemik səpgili yatalağın yoluxma mexanizmi haqqında doğru mülahizədir:**

A) yoluxmuş bitlərin fekalisinin zədələnmiş dəriyə sürtülməsi

B) yoluxmuş bitlərin hemolimfasının zədələnmiş dəriyə sürtülməsi

C) yoluxmuş ağcaqanadların qan sorması

D) yoluxmuş gənələrin qan sorması

E) yoluxmuş moskit milçəklərinin qan sorması

**312. Səpgili yatalağın mikrobioloji diaqnostikasında tətbiq edilir:**

A) seroloji üsul

B) mikroskopik üsul

C) bakterioloji üsul

D) dəri-allergik üsul

E) toksinin neytrallaşma reaksiyası

**313. Brill-Zinsser xəstəliyi üçün doğru mülahizədir::**

A) epidemik səpgili yatalağın endogen residividir

B) epidemik qayıdan yatalağın endogen residividir

C) Coxiella burnetii tərəfindən törədilir

D) Borrelia burgdorferi tərəfindən törədilir

E) endemik qayıdan yatalağın endogen residividir

**314. Endemik səpgili yatalağın törədicisidir:**

A) Rickettsia typhi

B) Borrelia duttoni

C) Rickettsia prowazekii

D) Coxiella burnetii

E) Borrelia recurrentis

**315. Endemik səpgili yatalaq üçün doğru mülahizədir:**

A) infeksiya mənbəyi xəstə heyvanlardır, gənələr vasitəsilə yoluxur

B) infeksiya mənbəyi xəstə insanlardır, ağcaqanadlar vasitəsilə yoluxur

C) infeksiya mənbəyi xəstə insanlardır, bitlər vasitəsilə yoluxur

D) infeksiya mənbəyi xəstə quşlardır, hava-damcı və hava-toz yolu ilə yoluxur

E) infeksiya mənbəyi xəstə insanlardır, fekal-oral mexanizmlə yoluxur

**316. Səpgili yatalagın müalicəsində istifadə edilir:**

A) tetrasiklin

B) penisillin G

C) antitoksik zərdab

D) anatoksin

E) asiklovir

**317. Q-qızdırmasının törədicisidir:**

A) Coxiella burnetii

B) Rickettsia prowazekii

C) Borrelia burgdorferi

D) Rickettsia typhi

E) Ehrlichia sennetsu

**318. Coxiella burnetii:**

A) obliqat hüceyrədaxili parazitdir, toyuq embrionlarında kultivasiya edilir

B) Qram mənfi bakteriyadır, adi qidalı mühitlərdə kultivasiya edilir

C) Qram müsbət bakteriyadır, adi qidalı mühitlərdə kultivasiya edilir

D) hüceyrə divarı olmayan bakteriyadır, adi qidalı mühitlərdə kultivasiya edilir

E) hüceyrə divarı olmayan bakteriyadır, zənginləşdirilmiş qidalı mühitlərdə kultivasiya edilir

**319. Bu bakteriyalar xəstə heyvanların ət və süd məhsullarından alimentar yolla yoluxaraq zoonoz infeksiya törədir. Endosporaya bənzər strukturlar əmələ gətirdiyi üçün ətraf mühüt amillərinə kifayət qədər davamlıdır, südün pasterizasiyası onları məhv etmir:**

A) Coxiella burnetii

B) Brusella melitensis

C) Bacillus anthrasis

D) Salmonella Typhimurium

E) Ehrlichia sennetsu

**320. Q-qızdırması üçün doğru mülahizə *deyil*:**

A) infeksiya mənbəyi ətraf mühit obyektləridir, aerogen mexanizmlə yoluxur

B) infeksiya mənbəyi xəstə heyvanlardır, aerogen mexanizmlə yoluxur

C) infeksiya mənbəyi xəstə heyvanlardır, gənələrin dişləməsi yoluxur

D) infeksiya mənbəyi xəstə heyvanlardır, alimentar yolla yoluxur

E) xəstə heyvanların ət və süd məhsullarından yoluxur

**321. Q-qızdırmasının əsas klinik əlamətlərindəndir:**

A) pnevmoniya

B) dermatit

C) sarılıq

D) xoralı kolit

E) qastroenterit

**322. Chlamydia trachomatis-in törətdiyi xəstəliklərə aiddir:**

**1.Urogenital infeksiyalar;**

**2.Qastroenterit;**

**3.Meninqoensefalit;**

**4.Traxoma;**

**5.Dermatit;**

**6.Hepatit;**

**7.Zöhrəvi limfoqranuloma;**

A) 1, 4, 7

B) 2, 3, 4

C) 4, 5, 7

D) 3, 4, 5

E) 1, 4, 6

**323. Traxoma üçün düzgün mlahizədir:**

A) infeksiya mənbəyi xəstə insanlardır, təmas mexanizmi ilə yoluxur

B) infeksiya mənbəyi xəstə quşlardır, hava-damcı və hava-toz yolu ilə yoluxur

C) infeksiya mənbəyi xəstə heyvanlardır, gənələrin dişləməsi yoluxur

D) infeksiya mənbəyi xəstə insanlardır, fekal-oral mexanizmlə yolla yoluxur

E) infeksiya mənbəyi xəstə insanlardır, aerogen mexanizmlə yoluxur

**324. Traxoma üçün düzgün mlahizə *deyil*:**

A) infeksiya mənbəyi xəstə heyvanlardır, transmissiv mexanizmlə yoluxur

B) infeksiya mənbəyi xəstə insanlardır, təmas mexanizmi ilə yoluxur

C) Chlamydia trachomatis-in A, B, Ba və C serotipləri tərəfindən törədilir

D) keratokonyuktivit əlamətləri ilə müşayiət olunur

E) konyuktiva epitelində hüceyrədaxili əlavələr müşahidə edilir

**325. Təmas mexanizmi ilə yoluxur:**

A) traxoma

B) malyariya

C) qayıdan yatalaq

D) səpgili yatalaq

E) qızıl yel

**326. Traxomanın diaqnostikasında istifadə edilir:**

A) mikroskopik üsul

B) bakterioloji üsul

C) dəri-allergik sınaq

D) komplementin birləşmə reaksiyası

E) aqqlütinasiya reaksiyası

**327. Uretrit əlamətləri olan xəstənin uretrasından götürülmüş ifrazatdan hazırlanmış yaxmanın mikroskopik müayinəsi zamanı az sayda leykosit və epitel hüceyrələri müşahidə edilmişdir. Gimza üsulu ilə boyadılmış yaxmanın mikroskopik müayinəsində hüceyrədaxili əlavələr aşkar edilir. Ehtimal edilən törədici:**

A) Chlamydia trachomatis

B) Neisseria gonorrhoeae

C) Mycoplasma hominis

D) Trichomonas vaginalis

E) Gardnerella vaginalis

**328. Urogenital xlamidioz Chlamydia trachomatis-in hansi serotipləri ilə törədilir?**

A) D-K

B) A, B, Ba, C

C) L1, L2, L3

D) A-D

E) K-L

**329. Urogenital xlamidiozun fəsadlaşmalarına aiddir:**

A) Reyter sindromu

B) Hetçinson triadası

C) Leyner sindromu

D) toksik şok sindromu

E) postinfeksion ensefalomielit

**330. Xəstə ananın doğuş yollarından keçərkən yenidogulmuşların hansı xəstəliklə yoluxma ehtimalı mövcuddur?**

A) hüceyrədaxili əlavəli konyuktivit

B) məxmərək

C) toksoplazmoz

D) poliomielit

E) epidemik parotit

**331. Xəstə ananın doğuş yollarından keçərkən yenidogulmuşlarda hüceyrədaxili əlavəli konyuktivit və pnevmoniya kimi xəstəliklər törədir:**

A) Chlamydia trachomatis

B) Neisseria gonorrhoeae

C) Mycoplasma genitalium

D) Trichomonas vaginalis

E) Gardnerella vaginalis

**332. Urogenital xlamidiozun diaqnostikasında istifadə edilir:**

A) immunoflüoressensiya reaksiyası

B) presipitasiya reaksiyası

C) immunoelektroforez

D) komplementin birləşmə reaksiyası

E) aqqlütinasiya reaksiyası

**333. Urogenital xlamidiozun müalicəsində istifadə edilir:**

A) tetrasikilin və azitromisin

B) penisillin G və streptomisin

C) amoksisillin və metronidazol

D) penisillin G və amoksisillin

E) biseptol və və metronidazol

**334. Zöhrəvi limfaqranuloma Chlamydia trachomatis-in hansi serotipləri ilə törədilir?**

A) L1, L2, L3

B) A, B, Ba, C

C) D-K

D) A-D

E) K-L

**335. Zöhrəvi limfoqranulomanın törədicisidir:**

A) Chlamydia trachomatis

B) Neisseria gonorrhoeae

C) Mycoplasma genitalium

D) Treponema pallidum

E) Gardnerella vaginalis

**336. Chlamydia pneumoniae törədir:**

A) atipik pnevmoniya

B) krupoz pnevmoniya

C) pnevmosistoz pnevmoniyası

D) giqant hüceyrəli pnevmoniya

E) bronxopnevmoniya

**337. Chlamydia pneumoniae infeksiyalarının diaqnostikasında istifadə edilir:**

A) immunoferment analiz

B) presipitasiya reaksiyası

C) müqabil immunoelektroforez

D) komplementin birləşmə reaksiyası

E) aqqlütinasiya reaksiyası

**338. Chlamydia psittaci törədir:**

A) ornitoz

B) infeksion mononukleoz

C) su çiçəyi

D) poliomielit

E) Q-qızdırması

**339. Ornitoz üçün doğru mülahizədir:**

A) infeksiya mənbəyi xəstə quşlardır, hava-damcı və hava-toz yolu ilə yoluxur

B) infeksiya mənbəyi xəstə insanlardır, transmissiv mexanizmlə yoluxur

C) infeksiya mənbəyi xəstə quşlardır, bitlər vasitəsilə yoluxur

D) infeksiya mənbəyi xəstə insanlardır, fekal-oral mexanizmlə yoluxur

E) infeksiya mənbəyi gəmiricilərdir, təmas mexanizmi ilə yoluxur

**340. Chlamydia psittaci törədir:**

A) atipik pnevmoniya

B) krupoz pnevmoniya

C) pnevmosistoz pnevmoniyası

D) zöhrəvi limfoqranuloma

E) urogenital xlamidioz

**341. Ornitozun əsas klinik əlamətidir:**

A) pnevmoniya

B) dermatit

C) ifliclər

D) qıcolma

E) qastroenterit

**342. Ornitozun diaqnostikasında istifadə edilir:**

A) qan zərdabında anticisimlərin təyini

B) bəlğəmin mikroskopik müayinəsi

C) immunoblottinq

D) bioloji üsul

E) həlqə presipitasiya reaksiyası

**343. Hüceyrə divarının olmaması mikoplazmalara hansı xüsusiyyətlər verir?**

**1.Beta-laktam antibiotiklərinə davamlılıq;**

**2.Hüceyrədaxili parazitizm;**

**3.Sahib hüceyrələrin membranına tropizm;**

**4.Qidalı mühitlərə tələbkarlıq;**

**5.Polimorfizm;**

A) 1, 5

B) 1, 2

C) 3, 5

D) 4, 5

E) 2, 3

**344. Mikoplazmalar kultivasiya edilir:**

A) zərdab əlavə edilmiş ürək beyin infuziya aqarında

B) qlükoza əlavə edilmiş qanlı aqarda

C) Kitt-Tarotsi mühitində

D) adi qidalı mühitlərdə

E) qlükoza əlavə edilmiş ət-peptonlu bulyonda

**345. Bərk qidalı mühitlərdə mikoplazmaların koloniyaları:**

A) yumurta gözcüyünü xatırladır

B) metal parılaqlığına malik qırmızı rəngdə olur

C) “aslan yalı”, yaxud “meduz başını” xatırladır

D) molyar dişləri xatırladır

E) ətrafı haşiyəli dəsmalı xatırladır

**346. Mikoplazmalar üçün doğru mülahizədir:**

A) membran parazitləridir

B) spora və kapsula əmələ gətirirlər

C) obliqat hüceyrədaxili parazitlərdir

D) adi qidalı mühitlərdə inkişaf edirlər

E) süni qidalı mühitlərdə inkişaf etmirlər

**347. Mikoplazmaların əsas patogenlik amillərindəndir:**

A) adhezinlər

B) lipopolisaxarid

C) lipoteyxoat turşusu

D) polimorfizm

E) kapsula

**348. Mikoplazmaların patogenliyi əlaqədardır:**

A) sahib hüceyrə membanının zədələnməsi ilə

B) sahib hüceyrələrdə zülal sintezinin blokadası ilə

C) sahib hüceyrələrdə siklik-AMF toplanması ilə

D) sinapslarda neyromediatorların parçalanması ilə

E) T-helperlərin poliklonal stimulyasiyası ilə

**349. Atipik pnevmoniyanın törədicisidir:**

A) Mycoplasma pneumoniae

B) Streptococcus pneumoniae

C) Klebsiella pneumoniae

D) Rickettsia prowazekii

E) Borrelia burgdorferi

**350. Urogenital infeksiya törədir:**

A) Mycoplasma hominis

B) Leptospira interrogans

C) Coxiella burnetii

D) Chlamydia psittaci

E) Borrelia burgdorferi

**351. Mikoplazmaların törətdiyi xəstəliklərə aid *deyil*:**

A) qastroenterit

B) pnevmoniya

C) faringit

D) artrit

E) uretrit

**352. Uretrit əlamətləri olan xəstənin uretrasından götürülmüş ifrazatdan hazırlanmış yaxmanın mikroskopik müayinəsi zamanı az sayda leykosit və epitel hüceyrələri müşahidə edilmişdir. Ehtimal edilən törədici:**

A) Mycoplasma hominis

B) Neisseria gonorrhoeae

C) Chlamydia psittaci

D) Borrelia burgdorferi

E) Coxiella burnetii

**353. Revmatoid artritin etiologiyasında rola malik olan mikoplazmadır:**

A) Mycoplasma fermentans

B) Mycoplasma hominis

C) Mycoplasma pneumoniae

D) Mycoplasma orale

E) Mycoplasma genitalium

**354. Patoloji materiallardan hazırlanmış yaxmalarda mikoplazmaları aşkar etmək üçün istifadə edilir:**

A) immunoflüoressensiya reaksiyası

B) Qram üsulu ilə boyama

C) sadə boyama üsulu

D) əzilən damla üsulu

E) Neysser üsulu ilə boyama

**355. Mikoplazmozların diaqnozunda istifadə edilir:**

A) zəncirvari polimeraza reaksiyası

B) aqqlütinasiya reaksiyası

C) komplementin birləşmə reaksiyası

D) presipitasiya reaksiyası

E) bioloji neytrallaşma reaksiyası

**356. Cinsi yolla yoluxaraq urogenital infeksiya törədən, hüceyrə divarı olmayan prokariot mikroorqanizmdir:**

A) Ureaplasma urealyticum

B) Neisseria gonorrhoeae

C) Chlamydia trachomatis

D) Trichomonas vaginalis

E) Gardnerella vaginalis

**357. Ureaplazmaları digər mikolazmalardan fərqləndirir:**

A) koloniyalarının çox kiçik olması

B) adi qidalı mühitlərdə inişaf qabiliyyəti

C) hüceyrə divarının olmaması

D) kapsula əmələ gətirməsi

E) hüceyrədaxili parazitizm

**358. Ureaplazmaları digər mikolazmalardan fərqləndirir:**

A) karbomidi parçalamaq qabiliyyəti

B) adi qidalı mühitlərdə inişaf qabiliyyəti

C) hüceyrə divarının olması

D) kapsula əmələ gətirməsi

E) hüceyrədaxili parazitizm

**359. Ureaplazmaların törətdiyi xəstəliklərə aid *deyil*:**

A) pnevmoniya

B) vaginit

C) salpingit

D) prostatit

E) uretrit

**360. Patoloji materiallardan hazırlanmış yaxmalarda ureaplazmaları aşkar etmək üçün istifadə edilir:**

A) immunoflüoressensiya reaksiyası

B) Qram üsulu ilə boyama

C) qaranlıq sahəli mikroskopiya

D) əzilən damla üsulu

E) Neysser üsulu ilə boyama

**361. Ureaplazmozun diaqnozunda istifadə edilir:**

A) zəncirvari polimeraza reaksiyası

B) aqqlütinasiya reaksiyası

C) komplementin birləşmə reaksiyası

D) presipitasiya reaksiyası

E) bioloji neytrallaşma reaksiyası

**362. Mikoplazmozun və ureaplazmozun müalicəsində istifadə edilir:**

A) tetrasiklin və makrolidlər

B) beta-laktam antibiotikləri

C) metronidazol və amoksisillin

D) asiklovir və interferon

E) streptomisin və ampisillin

**363. Keratinomikozlar zamanı zədələnir:**

A) epidermisin buynuz qatı və tüklərin səthi

B) epidermis, tüklər və dırnaqlar

C) derma və epidermis

D) ancaq tüklər

E) ancaq dəri və dırnaqlar

**364. Cilli dəmrovun törədicisidir:**

A) Malassezia furfur

B) Epidermophyton floccosum

C) Trichophyton rubrum

D) Piedraia hortae

E) Aspergillus flavus

**365. Malassezia cınsli göbələklər tərəfindən törədilir:**

A) çilli dəmrov

B) tinea pedis

C) xromomikoz

D) misetoma

E) favus

**366. 18 yaşlı oğlanın boyun nahiyyəsinin dərisində hipo- və hiperpiqmentləşmiş diskret ləkələr müşahidə edilmişdir. Ləkəli sahələrin qaşınması zamanı əmələ gələn kəpəyəbənzər pulcuqların mikroskopiyasında girdə və oval formalı mayayabənzər hüceyrələr, qısa, əyilmiş və şaxəsiz hiflər aşkar edilmişdir. Ehtimal edilən xəstəlik:**

A) çilli dəmrov

B) ağ piedra

C) pulcuqlu dəmrov

D) qara dəmrov

E) epidermomikoz

**367. 22 yaşlı oğlanın döş qəfəsi və qarın nahiyyəsinin dərisində hipo- və hiperpiqmentləşmiş diskret ləkələr müşahidə edilmişdir. Ləkəli sahələrin qaşınması zamanı əmələ gələn kəpəyəbənzər pulcuqların mikroskopiyasında girdə və oval formalı mayayabənzər hüceyrələr, qısa, əyilmiş və şaxəsiz hiflər aşkar edilmişdir. Ehtimal edilən törədici:**

A) Malassezia furfur

B) Epidermophyton floccosum

C) Trichophyton rubrum

D) Piedraia hortae

E) Candida albicans

**368. Başin tüklü hissəsinin dərisində kəpəklənmə törədir:**

A) Malassezia furfur

B) Epidermophyton floccosum

C) Trichophyton rubrum

D) Piedraia hortae

E) Aspergillus flavus

**369. 22 yaşlı oğlanın döş qəfəsi və qarın nahiyyəsinin dərisində hipo- və hiperpiqmentləşmiş diskret ləkələr müşahidə edilmişdir. Ləkəli sahələrin qaşınması zamanı kəpəyəbənzər pulcuqlar əmələ gəlir. Diaqnozu müəyyənləşdirmək məqsədilə:**

A) pulcuqlar qələvi məhlulu ilə işlənildikdən sonra mikroskopiya edilir

B) pulcuqlar turşu məhlulu ilə işlənildikdən sonra mikroskopiya edilir

C) pulcuqlar turşu məhlulu ilə işlənildikdən sonra ət pepton aqarına inokulyasiya edilir

D) pulcuqlar turşu məhlulu ilə işlənildikdən sonra lesitinli ət pepton aqarına inokulyasiya edilir

E) pulcuqlar turşu məhlulu ilə işlənildikdən sonra Endo mühitinə inokulyasiya edilir

**370. Dermatomikozlar zamanı zədələnir:**

A) dəri epidermisi, dırnaqlar, tüklər

B) dəri, dərialtı toxuma, fassiyalar

C) dərialtı toxuma, əzələlər, dırnaqlar

D) tüklər, daxili orqanlar, əzələlər

E) fassiyalar, əzələlər, epidermisin buynuz qatı

**371. Dermatomikozların törədiciləridir:**

A) Microsporum, Trichophyton, Epidermophyton

B) Epidermophyton, Cryptococcus, Fonsecaea

C) Trichophyton, Sporothrix, Histoplasma

D) Cryptococcus, Phialophora, Fonsecaea

E) Microsporum, Madurella, Epidermophyton

**372. Dermatofitlərin kultivasiya şəraiti:**

A) $25^0$C-də, bir-neçə həftə

B) $37^0$C-də, bir-neçə həftə

C) $37^0$C-də, 1-2 gün

D) $25^0$C-də, 1-2 gün

E) $37^0$C-də, bir-neçə ay

**373. Dermatofitlərin kultivasiya mühiti:**

A) Saburo

B) Endo

C) Klauberq

D) Kliqler

E) Levenşteyn-Yensen

**374. Dermatofitlərin yoluxma mexanizmidir:**

A) təmas

B) fekal-oaral

C) transmissiv

D) transplasentar

E) hava-damcı

**375. Dermatofitlərin əsas patogenlik amilidir:**

A) keratinaza

B) lesitinaza

C) kapsula

D) makrokonidi

E) mikrokonidi

**376. Trichophyton cinsli göbələklər zədələyir:**

**1.Dərı;**

**2.Tüklər;**

**3.Dırnaqlar;**

**4.Dərialtı birləşdirici toxuma**

A) 1, 2, 3

B) ancaq 1

C) ancaq 2 və 3

D) ancaq 1 və 3

E) 1, 2, 4

**377. Dəri, tük və dırnaqları zədələyir, qidalı mühitdə arakəsməli miseli, səthi hamar makrokonidilər və mikrokonidi əmələ gətirir:**

A) Trichophyton cinsli göbələklər

B) Epidermophyton cinsli göbələklər

C) Candida cinsli göbələklər

D) Aspergillus cinsli göbələklər

E) Mucor cinsli göbələklər

**378. Microsporum cinsli göbələklər zədələyir:**

**1.Dərı;**

**2.Tüklər;**

**3.Dırnaqlar;**

**4.Dərialtı birləşdirici toxuma;**

A) 2, 3

B) 2, 4

C) 1, 4

D) 3, 4

E) ancaq 4

**379. Tükləri və dırnaqları zədələyir, qidalı mühitdə arakəsməli miseli, qalındivarlı, iyəbənzər, səthi çıxıntılarla malik makrokonidilər əmələ gətirir:**

A) Microsporum cinsli göbələklər

B) Epidermophyton cinsli göbələklər

C) Candida cinsli göbələklər

D) Aspergillus cinsli göbələklər

E) Penisillum cinsli göbələklər

**380. Epidermophyton cinsli göbələklər zədələyir:**

**1.Dərı;**

**2.Tüklər;**

**3.Dırnaqlar;**

**4.Dərialtı birləşdirici toxuma**

A) ancaq 1 və 3

B) ancaq 1

C) 1, 2, 3

D) ancaq 2 və 3

E) 1, 2, 4

**381. Dərini və dırnaqları zədələyir, qidalı mühitdə arakəsməli miseli və ancaq səthi hamar makrokonidilər əmələ gətirir:**

A) Epidermophyton cinsli göbələklər

B) Microsporum cinsli göbələklər

C) Candida cinsli göbələklər

D) Aspergillus cinsli göbələklər

E) Sporothrix cinsli göbələklər

**382. Orta yaşlı qadının ayaqaltı dərisində qaşınma hissi ilə müşayiət olunan qabıqlanma və çatlar müşahidə edilmişdir. Dəri pulcuğunun mikroskopik müayinəsində arakəsməli miselilər aşkar edilmişdir. Göstərilən prosesi törədə bilər:**

A) Trichophyton və Epidermophyton cinsli göbələklər

B) Microsporum və Candida cinsli göbələklər

C) Trichophyton, Microsporum və Candida cinsli göbələklər

D) Trichophyton, Microsporum və Aspergillus cinsli göbələklər

E) Trichophyton, Microsporum və Sporothrix cinsli göbələklər

**383. Orta yaşlı qadın əl barmaqlarının dırnaq lövhələrinin tutqunlaşması və kövrəkləşməsi əlamətləri ilə həkimə müraciət etmişdir. Mikroskopik müayinədə arakəsməli miselilər aşkar edilmişdir. Göstərilən prosesi törədə bilər:**

A) Trichophyton, Microsporum və Epidermophyton cinsli göbələklər

B) ancaq Trichophyton və Microsporum cinsli göbələklər

C) ancaq Trichophyton və Epidermophyton cinsli göbələklər

D) Trichophyton, Microsporum və Candida cinsli göbələklər

E) Trichophyton, Microsporum və Sporothrix cinsli göbələklər

**384. Orta yaşlı qadın əl barmaqlarının dırnaq lövhələrinin tutqunlaşması və kövrəkləşməsi əlamətləri ilə həkimə müraciət etmişdir. Mikroskopik müayinədə arakəsməli miselilər aşkar edilmişdir. Göstərilən proses adlanır:**

A) onixomikoz

B) tinea pedis

C) tinea cruris

D) tinea capitis

E) ektotriks

**385. Onixomikozların müalicəsində istifadə edilir:**

A) itrakonazol

B) metronidazol

C) asiklovir

D) sulfametaksozol

E) penisillin

**386. Favusun törədicisidir:**

A) Trichophyton schoenleini

B) Epidermophyton mentagrophytes

C) Trichophyton tonsurans

D) Trichophyton violaseum

E) Microsporum canis

**387. Trichophyton schoenleini törədir:**

A) favus

B) çilli dəmirov

C) pulcuqlu dəmirov

D) sporotrixioz

E) cəhrayı dəmrov

**388. Məktəb yaşlı oğlanda başın tüklü hissəsində skutulaların əmələ gəlməsi ilə ocaqlı keçəllik əlamətləri müşahidə edilmişdir. Mikroskopik müayinədə zədələnmiş tüklərin daxilində arakəsməli miselilər və qaz qabarcıqları aşkar edilmişdir. Göstərilən proses adlanır:**

A) favus

B) çilli dəmirov

C) pulcuqlu dəmirov

D) sporotrixioz

E) onixomikoz

**389. Məktəb yaşlı oğlanda başın tüklü hissəsində skutulaların əmələ gəlməsi ilə ocaqlı keçəllik əlamətləri müşahidə edilmişdir. Mikroskopik müayinədə zədələnmiş tüklərin daxilində arakəsməli miselilər və qaz qabarcıqları aşkar edilmişdir. Göstərilən prosesi törədə bilər:**

A) Trichophyton schoenleini

B) Epidermophyton mentagrophytes

C) Aspergillus niger

D) Sporothrix schenckii

E) Candida albicans

**390. Məktəb yaşlı oğlanda başın tüklü hissəsində qabıqlanma, qaşınma və alopesiya əlamətləri müşahidə edilmişdir. Diaqnozu müəyyənləşdirmək məqsədilə zədələnmiş tüklər:**

A) qələvi məhlulu ilə işlənildikdən sonra mikroskopiya edilir

B) turşu məhlulu ilə işlənildikdən sonra mikroskopiya edilir

C) turşu məhlulu ilə işlənildikdən sonra ət pepton aqarına inokulyasiya edilir

D) turşu məhlulu ilə işlənildikdən sonra lesitinli ət pepton aqarına inokulyasiya edilir

E) turşu məhlulu ilə işlənildikdən sonra Endo mühitinə inokulyasiya edilir

**391. Dermatomikozların diaqnostikasında istifadə edilir:**

A) mikroskopik üsul

B) seroloji üsul

C) Burri üsulu

D) molekulyar-genetik üsul

E) Veynberq üsulu

**392. Dərialtı toxumaların, əzələ və fassiyaların zədələnməsi xarakterdir:**

A) subkutan mikozlar üçün

B) çilli dəmrov üçün

C) keratomikozlar üçün

D) dermatomikozlar üçün

E) mikotoksikozlar üçün

**393. Dərialtı mikozlara aiddir:**

**1.Histoplazmoz,**

**2.Sporotrixoz,**

**3.Misetoma,**

**4.Koksidioidoz,**

**5.Xromomikoz,**

**6.Dermatomikoz;**

A) 2, 3, 5

B) 1, 3, 6

C) 1, 2, 3

D) 2, 4, 6

E) 1, 2, 5

**394. Sporotrixoz üçün xarakterdir:**

A) dərialtı toxumaların zədələnməsi

B) tüklərin zədələnməsi

C) dırnaqların zədələnməsi

D) başın tüklü hissəsinin dərisinin zədələnməsi

E) alopesiya

**395. Sporothrix schenckii-in Saburo mühitində inkişaf etmiş kulturasından hazırlanmış yaxmada müşahidə edilir:**

A) arakəsmələrə malik şaxəli miselilər

B) oval mayayabənzər hüceyrələr

C) uzunsov siqarabənzər hüceyrələr

D) tumurcuqlanan mayayabənzər hüceyrələr

E) mielilər və mayayabənzər hüceyrələr

**396. Sporotrixoz zamanı zədələnmiş nahiyyələrdən götürülmüş materiallardan hazırlanmış yaxmada aşkar edilir:**

A) kiçik siqarabənzər maya hüceyrələri

B) arakəsmələrə malik şaxəli miselilər

C) arakəsməsiz şaxəli miselilər

D) mikrokonidilərə malik şaxəli miselilər

E) makrokonidilərə malik şaxəli miselilər

**397. Sporotrixoz zamanı infeksiya mənbəyidir:**

A) torpaq

B) xəstə heyvanlar

C) xəstə insan

D) xəstə quşlar

E) ağcaqanadlar

**398. Maya (toxuma) formaları qəhvəyi rəngli kürəvi hüceyrələrdən və miselial forması müxtəlif tip konidilərə malik arakəsməli, tünd qəhvəyi rəngli miselilərə ibarətdir:**

A) xromomikozun törədiciləri

B) sporotrixozun törədiciləri

C) ziqomikozun törədiciləri

D) kriptokokozun törədiciləri

E) aspergillozun törədiciləri

**399. Xromomikozun zamanı infeksiya mənbəyidir:**

A) torpaq

B) xəstə insan

C) xəstə heyvanlar

D) xəstə quşlar

E) gənələr

**400. Dərinin mikrotravma yerlərindən törədicinin daxil olduğu yerdə epidermal toxumanın hiperplaziyası nəticəsində proqressivləşən və gül kələmininə bənzər, yayılmağa meyilli qranulomatoz düyünlərin əmələ gəlməsi müşahidə edilir:**

A) xromomikozda

B) blastomikozda

C) leyşmaniozda

D) histoplazmozda

E) qazlı qanqrenada

**401. Xromomikoz zamanı zədələnmiş nahiyyələrdən götürülmüş biopsiya materiallardan hazırlanmış və KOH məhlulu ilə işlənilmiş preparatlarda aşkar edilir:**

A) qəhvəyi rəngli kürəvi hüceyrələr

B) arakəsmələrə malik şaxəli miselilər

C) arakəsməsiz şaxəli miselilər

D) mikrokonidilərə malik şaxəli miselilər

E) makrokonidilərə malik şaxəli miselilər

**402. Xromomikozun törədiciləri orqanizmə daxil olur:**

A) dərinin mikrotravma yerlərindən

B) mədə-bağırsaq traktının selikli qişasından

C) qansoran həşaratların dişləməsi vasitəsilə

D) tənəffüs yollarının selikli qişasından

E) xəstə heyvanların dişləməsi vasitəsilə

**403. Eumikotik misetomanın törədiciləridir:**

A) Madurella cinsli göbələklər

B) Cryptococcus neoformans

C) Paracoccidioides braziliensis

D) Aspergillus cinsli göbələklər

E) Candida cinsli göbələklər

**404. Misetoma zamanı infeksiya mənbəyidir:**

A) torpaq

B) xəstə insan

C) xəstə heyvanlar

D) xəstə quşlar

E) moskit milçəkləri

**405. Misetomanın törədiciləri orqanizmə daxil olur:**

A) dərinin mikrotravma yerlərindən

B) mədə-bağırsaq traktının selikli qişasından

C) qansoran həşaratların dişləməsi vasitəsilə

D) tənəffüs yollarının selikli qişasından

E) xəstə heyvanların dişləməsi vasitəsilə

**406. Orta yaşlı kişinin sol ayağının ağrılı şişməsi ilə başlayan xəstəlik sonradan onun deformasiyası və dəri səthinə açılan fistulalardan irinli möhtəviyyatla müşayiət olunmuşdur. İrinli möhtəviyyatda diametri 2 mm-ə qədər olan bərk konsistensiyalı qranulalar aşkar edilir. Ehtimal edilən xəstəlik:**

A) misetoma

B) blastomikoz

C) leyşmanioz

D) histoplazmoz

E) xromomikoz

**407. Dimor göbələklərdir:**

**1.Aspergillus niger;**

**2.Histoplasma capsulatum;**

**3.Blastomyces dermatitidis;**

**4.Mucor musedo;**

**5.Coccidioides immitis;**

A) 2, 3, 5

B) 1, 2, 3

C) 2, 3, 4

D) 3, 4, 5

E) 1, 4, 5

**408. Sistem xarakterli mikozlara aiddir:**

**1.Aspergilloz;**

**2.Dermatomikoz;**

**3.Pnevmosistoz;**

**4.Koksidioidoz;**

**5.Histoplazmoz;**

**6.Blastomikoz;**

A) 4, 5, 6

B) 1, 2, 3

C) 2, 3, 4

D) 3, 4, 5

E) 1, 4, 5

**409. Toxumalarda endosporalara malik iri, ikiqatlı qalın divarlı sferula, orqanizmdən kənarda isə arakəsməli artrosporalı miselilər əmələ gətirir:**

A) Coccidioides immitis

B) Candida albicans

C) Paracoccidioides braziliensis

D) Sporothrix schenckii

E) Cryptococcus neoformans

**410. Zədələnmiş toxumalarda endosporalara malik sferula əmələ gətirir:**

A) Coccidioides immitis

B) Mucor musedo

C) Histoplasma capsulatum

D) Cryptococcus neoformans

E) Paracoccidioides braziliensis

**411. Coccidioides immitis sferulaları:**

A) endosporalara malik olub, qalın qişa ilə əhatə olunmuşdur

B) qidalı mühitlərdə formalaşır

C) sporangiosporalara malikdir

D) ətraf mühitdə formalaşır

E) daxilində udulmuş eritrositlər aşkar edilir

**412. Coccidioides immitis sferulaları:**

A) göbələyin toxuma formasıdır

B) qidalı mühitlərdə formalaşır

C) daxilində udulmuş leykositlər aşkar edilir

D) ətraf mühitdə formalaşır

E) daxilində udulmuş eritrositlər aşkar edilir

**413. Coccidioides immitis yoluxur:**

A) artrosporaların inhalyasiyası ilə

B) sferulaların qida ilə qəbulu nəticəsində

C) transmissiv yolla

D) xəstə heyvanların əti və sudü vasitəsilə

E) xəstə heyvanların dişləməsi vasitəsilə

**414. Koksididioidozun törədicisi orqanizmə daxil olur:**

A) aerogen yolla

B) qida ilə

C) transplasentar yolla

D) transmissiv yolla

E) cinsi yolla

**415. Coccidioides immitis-in Saburo mühitində inkişaf etmiş kulturasından hazırlanmış yaxmada müşahidə edilir:**

A) arakəsmələrə malik artrosporalı miselilər

B) oval mayayabənzər hüceyrələr

C) uzunsov siqarabənzər hüceyrələr

D) tumurcuqlanan mayayabənzər hüceyrələr

E) mielilər və mayayabənzər hüceyrələr

**416. Koksidioidoz zamanı ilkin infeksiya ocağı formalaşır:**

A) ağciyərlərdə

B) dəridə

C) qaraciyərdə

D) bağırsaqlarda

E) mərkəzi sinir sistemində

**417. Koksidioidoz zamanı bəlğəmin mikroskopik müayinəsində aşkar edilir:**

A) sferulalar

B) arakəsməli artrosporalı miselilər

C) tumurcuqlanan mayayabənzər hüceyrələr

D) arakəsməsiz artrosporalı miselilər

E) psevdomiselilər

**418. Koksidioidozun diaqnostikasında dəri-allergik sınaq üçün istifadə edilr:**

A) sferulin

B) trixofitin

C) blastomisin

D) mikotoksin

E) histoplazmin

**419. Histoplasma capsulatum-un toxuma forması:**

A) oval formalı, kapsulalı mayayabənzər hüceyrələrdir

B) arakəsmələrə malik şaxəli miselilərdir

C) arakəsməsiz şaxəli miselilərdir

D) ətraf mühitdə formalaşır

E) mielilər və mayayabənzər hüceyrələrdən ibarətdir

**420. Histoplasma capsulatum-un miselial forması:**

A) səthində çıxıntıları olan makrokonidilərə malikdir

B) oval formalı, kapsulalı mayayabənzər hüceyrələrdir

C) banan meyvəsinə oxşar makrokonidilərə malikdir

D) psevdomiselilərə malikdir

E) mielilər və mayayabənzər hüceyrələrdən ibarətdir

**421. Toxuma forması oval, kapsulalı mayayabənzər hüceyrələrdən ibarətdir, miselial forması isə səthində çıxıntıları olan makrokonidilərə malikdir:**

A) Histoplasma capsulatum

B) Mucor musedo

C) Coccidioides immitis

D) Cryptococcus neoformans

E) Aspergillus flavus

**422. Histoplasma capsulatum yoluxur:**

A) sporaların inhalyasiyası ilə

B) sferulaların qida ilə qəbulu nəticəsində

C) transmissiv yolla

D) xəstə heyvanların əti və sudü vasitəsilə

E) xəstə heyvanların dişləməsi vasitəsilə

**423. Histoplazmozun törədicisi orqanizmə daxil olur:**

A) aerogen yolla

B) qida ilə

C) transplasentar yolla

D) transmissiv yolla

E) cinsi yolla

**424. Histoplasma capsulatum-un Saburo mühitində inkişaf etmiş kulturasından hazırlanmış yaxmada müşahidə edilir:**

A) səthində çıxıntıları olan makrokonidilərə malik arakəsməli miselilər

B) oval mayayabənzər hüceyrələr

C) uzunsov siqarabənzər hüceyrələr

D) tumurcuqlanan uzunsov mayayabənzər hüceyrələr

E) mielilər və mayayabənzər hüceyrələr

**425. Histoplazmoz zamanı ilkin infeksiya ocağı formalaşır:**

A) ağciyərlərdə

B) dəridə

C) qaraciyərdə

D) bağırsaqlarda

E) mərkəzi sinir sistemində

**426. Histoplazmoz zamanı bəlğəmin mikroskopik müayinəsində aşkar edilir:**

A) oval mayayabənzər hüceyrələr

B) arakəsməli artrosporalı miselilər

C) makrokonidilərə malik arakəsməli miselilər

D) arakəsməsiz artrosporalı miselilər

E) psevdomiselilər

**427. Candida cinsli göbələklər:**

A) kürəvi, oval, uzunsov, tumurcuqlanan mayayabənzər hüceyrələrdir

B) səthində çıxıntıları olan makrokonidili miselilərə malikdir

C) artrosporalı arakəsməli miselilərə malikdir

D) hava sporaları olan arakəsməli miselilərə malikdir

E) sporangisporalarla zəngin arakəsməli miselilərə malikdir

**428. Candida albicans üşün xasdır:**

A) psevdomiseli

B) makrokonidi

C) artrospora

D) sferula

E) sporangiospora

**429. Candida albicans üşün xasdır:**

A) “rüşeym borucuğu” testi

B) penisillinə həssaslıq

C) kapsula əmələ gətirmə

D) aktiv hərəkət

E) sista əmələ gətirmə

**430. Candida albicans psevdomiselisi:**

A) ardıcıl düzülmüş uzunsov hüceyrələrdən ibarətdir

B) arakəsməli miselidir

C) arakəsməsiz miselidir

D) ümumi sitoplazmaya malik arakəsməsiz miselidir

E) ümumi nüvəyə malik arakəsməsiz miselidir

**431. Həqiqi miseli əmələ gətirir:**

A) Candida albicans

B) Candida tropicalis

C) Candida krusei

D) Candida glabrata

E) Candida parapsilosis

**432. Psevdomiseli əmələ *gətirmir*:**

A) Candida glabrata

B) Candida tropicalis

C) Candida krusei

D) Candida albicans

E) Candida parapsilosis

**433. Candida albicans üçün xasdır:**

**1.Artrospora;**

**2.Xlamidospora;**

**3.Psevdomiseli;**

**4.Blastospora;**

**5.Mikrokonidi;**

**6.Makrokonidi;**

A) 2, 3, 4

B) 1, 2, 3

C) 4, 5, 6

D) 3, 4, 5

E) 1, 4, 5

**434. Insan orqanizminin normal mikroflorasına aid *deyil*:**

A) listeriyalar

B) laktobakteriyalar

C) enterokoklar

D) streptokoklar

E) Candida cinsli göbələklər

**435. Candida cinsli göbələklər normada rast *gəlinmir*:**

A) sidik kisəsində

B) mədə-bağırsaq traktında

C) yuxarı tənəffüs yollarında

D) dəri səthində

E) sidik kanalında

**436. Kandidozun patogenetik amillərinə aid *deyil*:**

A) ürək çatışmazlığı

B) immun çatışmazlıqlar

C) antibiotiklərin uzunmüddətli istifadəsi

D) disbiozlar

E) sitostatiklərin istifadəsi

**437. Şəkərli diabeti olan 65 yaşlı qadında dilin və yumşaq damağın selikli qişalarının səthində ağ-bozumtul kəsmiyəbənzər ərp müşahidə edilmişdir. Mikroskopik müayinədə tumurcuqlanan mayayabənzər hüceyrələr və psevdomiselilər aşkar edilmişdir. Ehtimal edilən xəstəlik:**

A) kandidoz

B) leykoplakiya

C) leyşmanioz

D) herpes

E) parakoksidoidoz

**438. Şəkərli diabeti olan 65 yaşlı qadında dilin və yumşaq damağın selikli qişalarının səthində ağ-bozumtul kəsmiyəbənzər ərp müşahidə edilmişdir. Mikroskopik müayinədə tumurcuqlanan mayayabənzər hüceyrələr və psevdomiselilər aşkar edilmişdir. Ehtimal edilən törədici:**

A) Candida cinsli göbələklər

B) sadə herpes virusu

C) qızılca virusu

D) Epsteyn Barr virusu

E) Blastomyces dermatitidis

**439. "Süd yarası"-nın törədicisidir:**

A) Candida cinsli göbələklər

B) sadə herpes virusu

C) Streptococcus agalactiae

D) Epsteyn-Barr virusu

E) laktobakteriyalar

**440. Selikli qişaların kandidozunun təzahür formasıdır:**

A) süd yarası

B) leykoplakiya

C) blastomikoz

D) Koplik ləkələri

E) herpangina

**441. Selikli qişaların kandidozunun təzahür formasıdır:**

A) vulvovaginit

B) leykoplakiya

C) blastomikoz

D) Koplik ləkələri

E) herpangina

**442. Kandidozun daqnozunda istifadə *edilmir*:**

A) qanda spesifik anticisimlərin təyini

B) mikroskopik üsul

C) kultural üsul

D) qanda mannan polisaxaridlərinin təyini

E) qanda beta-qlükan polisaxaridlərinin təyini

**443. Kandidozun daqnozunda istifadə edilir:**

A) qanda mannan polisaxaridlərinin təyini

B) bioloji neytrallaşdırma reaksiyası

C) hemaqqlütinasiyanın ləngimə reaksiyası

D) qanda spesifik anticisimlərin təyini

E) bioloji üsul

**444. Kandidozun müalicəsində istifadə edilir:**

**1.Metronidazol;**

**2.Xloramfenikol;**

**3.Amfoterisin B;**

**4.Flukonazol;**

**5.Nistatin,**

**6.Asiklovir;**

A) 3, 4, 5

B) 2, 3, 4

C) 4, 5, 6

D) 1, 2, 6

E) 1, 2, 3

**445. Kandidozun profilaktikasında istifadə edilir:**

A) antifunqal preparatlarının qəbulu

B) vaksinasiya

C) seroprofilaktika

D) dezinfeksiya

E) xəstələrin təcrid olunması

**446. Patoloji materiallardan hazırlanmış yaxmalarda kapsulaya malik maya hüceyrəsi formasında aşkar olunur:**

A) Cryptococcus neoformans

B) Coccidioides immitis

C) Sporothrix schenckii

D) Candida albicans

E) Aspergillus flavus

**447. Polisaxarid tərkibli qalın kapsulaya malik olan mayayabənzər göbələkdır:**

A) Cryptococcus neoformans

B) Sporothrix schenckii

C) Coccidioides immitis

D) Blastomyces dermatitidis

E) Candida albicans

**448. Cryptococcus neoformans:**

A) kapsulalı, kürəvi mayayabənzər hüceyrələrdir

B) səthində çıxıntıları olan makrokonidili miselilərə malikdir

C) artrosporalı arakəsməli miselilərə malikdir

D) hava sporaları olan arakəsməli miselilərə malikdir

E) sporangisporalarla zəngin arakəsməli miselilərə malikdir

**449. Şərti-patogen göbələklərə aiddir:**

**1.Histoplasma;**

**2.Candida;**

**3.Cryptococcus;**

**4.Aspergillus;**

**5.Blastomyces;**

**6.Sporothrix;**

A) 2, 3, 4

B) 1, 2, 3

C) 2, 4, 5

D) 3, 5, 6

E) 1, 4, 5

**450. Şərti-patogen göbələklərə aid *deyil*:**

**1.Histoplasma;**

**2.Candida;**

**3.Cryptococcus;**

**4.Aspergillus;**

**5.Blastomyces;**

**6.Mucor;**

A) 1, 5

B) 2, 3

C) 2, 4

D) 3, 6

E) 1, 3

**451. Cryptococcus neoformans-ın patogenlik amilidir:**

A) kapsula

B) xlamidospora

C) psevdomiseli

D) artrospora

E) endotoksin

**452. İmmun çatışmazlığı olan şəxslərdə kriptokok infeksiyasının əsas klinik təzahürüdür:**

A) meningit

B) dermatit

C) hepatit

D) endokardit

E) artrit

**453. Arakəsməli, şaxələnən miselilərə malikdir, konididaşıyıcının genişlənmiş ucunda suçiləyəndən tökülən su şırnağına bənzəyən konidi zəncirləri mövcuddur:**

A) Aspergillus cinsli göbələklər

B) Penicillum cinsli göbələklər

C) Mucor cinsli göbələklər

D) Rhizopus cinsli göbələklər

E) Cryptococcus cinsli göbələklər

**454. Aspergillomanın patogenetik mexanizmidir:**

A) göbələk hiflərindən ibarət kürə formalı törəmənin əmələ gəlməsi

B) göbələk hiflərinin toxumalara invaziyası ilə şərtlənən bəd xassəli şiş

C) göbələk hiflərinin toxumalara invaziyası ilə şərtlənən xoş xassəli şiş

D) göbələk antigenlərinə qarşı ləng tipli yüksək həssaslıqla şərtlənən qranuloma

E) göbələk antigenlərinə qarşı ani tipli yüksək həssaslıqla şərtlənən produktiv iltihab

**455. Daha çox immun çatışmazlığı olan şəxslərdə müşahidə edilir:**

A) invaziv aspergilloz

B) allergik bronx-ağciyər aspergillozu

C) ekzogen allergik alveolit

D) aspergilloma

E) atopik aspergilloz

**456. Aspergillus cinsli göbələk hiflərinin invaziv proses törətmədən bronxlarda kolonizasiyası nəticəsində atopik şəxslərdə baş verir:**

A) allergik bronx-ağciyər aspergillozu

B) invaziv aspergilloz

C) aflatoksikoz

D) aspergilloma

E) sarkoma

**457. Aspergillus flavus aflatoksinləri ilə törədilir:**

A) mikotoksikoz

B) Reyter sindromu

C) aspergilloma

D) invaziv aspergilloz

E) misetoma

**458. X, Y və Z mikroorqanizmlərini müəyyən edin:**

| Mikroorqanizm | Xəstəlik |
|---|---|
| X | Mikotoksikoz |
| Y | Çilli dəmrov |
| Z | Misetoma |

A) X-Aspergillus flavus, Y-Malassezia furfur, Z-Madurella

B) X-Aspergillus terreus, Y-Piedraia hortae, Z-Histoplasma capsulatum

C) X-Mucor musedo, Y-Candida albicans, Z-Madurella

D) X-Penicillum notatum, Y-Aspergillus fumigatus, Z-Mucor musedo

E) X-Cryptococcus neoformans, Y-Malassezia furfur, Z-Madurella

**459. X, Y və Z mikroorqanizmlərini müəyyən edin:**

| Mikroorqanizm | Xəstəlik |
|---|---|
| X | Misetoma |
| Y | Süd yarası |
| Z | Keçəllik |

A) X-Madurella, Y-Candida albicans, Z-Trichophyton schoenleini

B) X-Aspergillus terreus, Y-Candida albicans, Z-Histoplasma capsulatum

C) X-Mucor musedo, Y-Candida albicans, Z-Trichophyton schoenleini

D) X-Madurella, Y-Candida albicans, Z-Mucor musedo

E) X-Cryptococcus neoformans, Y-Candida albicans, Z-Trichophyton schoenleini

**460. Aspergillozun diaqnozu üçün düzgün mülahizə *deyil*:**

A) bəlğəmdə Aspergillus göbələklərinin aşkar edilməsi bütün hallarda invaziv aspergillozun diaqnozunu təsdiq edir

B) Aspergillus cinsli göbələklərin kulturasını almaq üçün Saburo mühitindın istifadə etmək olar

C) immun çatışmazlığı olan şəxslərdə invaziv aspergillozun seroloji diaqnozu informativ deyil

D) bəlğəmdən hazırlanmış yaxmalarda Aspergillus göbələklərinin miselilərini mikroskopik aşkar etmək mümkündür
E) müayinə materiallarının Aspergillus cinsli göbələklərlə kontaminasiyası istisna edilməlidir
**461. Pnevmosistoz pnevmoniyası müşahidə edilir:**
A) QİÇS xəstəliyində
B) vərəm xəstəliyində
C) aspergillozda
D) difteriyada
E) skarlatinada
**462. Pnevmosistoz pnevmoniyasının patogenezi:**
A) alveollarda qaz mübadiləsinin blokadası
B) bronxların selikli qişasının iltihabı
C) bronxospazmla şərtlənən tənəffüs çatışmazlığı
D) ağciyərlərdə kavernaların əmələ gəlməsi
E) Pneumocystis jirovecii-yə qarşı atopik reaksiya
**463. Pneumocystis jirovecii:**
A) şərti-patogen göbələkdir
B) şərti-patogen bakteriyadır
C) adi qidalı mühitlərdə inkişaf edir
D) obliqat hüceyrədaxili parazitdir
E) Saburo mühitində inkişaf edir
**464. Pneumocystis jirovecii:**
A) orqanizmin normal mikroflorasının tərkibinə daxildir
B) hüceyrə kulturasında sitopatik dəyişiklik törədir
C) adi qidalı mühitlərdə yaxşı inkişaf edir
D) obliqat hüceyrədaxili parazitdir
E) Saburo mühitində kultivasiya edilir
**465. Pnevmosistoz pnevmoniyasının diaqnozunda istifadə edilir:**
A) mikroskopik üsul
B) seroloji üsul
C) bakterioloji üsul
D) virusoloji üsul
E) dəri-allergik reaksiya
**466. Pnevmosistoz pnevmoniyasının müalicəsində istifadə edilir:**
A) biseptol

B) metronidazol

C) flukonazol

D) ketoakonazol

E) penisillin G

**467. Bağırsaq protozoozlarının əsas yoluxma yoludur:**

A) fekal-oral

B) transmissiv

C) parenteral

D) transplasentar

E) cinsi

**468. Bağırsaq invaziyası törədir:**

A) Giardia lamblia

B) Toxoplasma gondii

C) Leishmania donovani

D) Trypanosoma cruzi

E) Trichomonas vaginalis

**469. Giardia lamblia:**

A) trofozoit və sista formasında olur

B) ancaq trofozoit formasında olur

C) hərəkətsizdir

D) apikal kompleksə malikdir

E) sista əmələ gətirmir

**470. Giardia lamblia trofozoitləri üçün xasdır:**

A) hərkətlidir

B) hərəkətsizdir

C) dörd nüvəlidir

D) apikal kompleksə malikdir

E) psevdopodilərə malikdir

**471. Giardia lamblia üçün xasdır:**

**1.Psevdopodilər;**

**2.Apikal kompleks;**

**3.Sista;**

**4.Sorucu disk;**

**5.Psevdosista;**

**6.Flagella**

A) 3, 4, 6

B) 2, 3, 4

C) 4, 5, 6

D) 1, 3, 4

E) 2, 5, 6

**472. Giardia lamblia üçün xas *deyil*:**

**1.Sorucu disk;**

**2.Apikal kompleks;**

**3.Sista;**

**4.Psevdopodilər;**

**5.Psevdosista;**

**6.Flagella**

A) 2, 4, 5

B) 1, 3, 4

C) 4, 5, 6

D) 1, 3, 6

E) 2, 5, 6

**473. Giardia lamblia orqanizmdə lokalizasiya olunur:**

A) nazik bağırsaqların selikli qişalarında

B) yoğun bağırsağın selikli qişalarında

C) mədənin selikli qişasında

D) kor bağırsağın selikli qişasında

E) ileosekal nahiyyənin selikli qişasında

**474. Qiardiozun klinik təzahürlərinə aiddir:**

A) dispeptik pozğunluqlar

B) qizdırma

C) sarılıq

D) limfoadenopatiya

E) stomatit

**475. Qiardioz üçün xarakter *deyil:***

A) onikibarmaq bağırsaq xoraları

B) nazik bağırsaların iltihabı

C) nazik bağırsaq xovlarının atrofiyası

D) diareya

E) dispeptik pozğunluqlar

**476. Qiardiozun diaqnostikasında istifadə edilir:**

A) mikroskopik üsul

B) bakterioloji üsul

C) komplementin birləşmə reaksiyası

D) hemaqqlütinasiya reaksiyası

E) dəri-allergik reaksiya

**477. Diareyalı xəstənin nəcisinin nativ mikroskopiyasında 10-20 mkm uzunluqlu, ürək formalı, səyrimə tipli hərəkət edən parazitlər aşkar edilmişdir. Ehtimal olunan törədici:**

A) Giardia lamblia

B) Toxoplasma gondii

C) Leishmania donovani

D) Entamoeba histolytica

E) Trichomonas vaginalis

**478. Entamoeba histolytica:**

A) trofozoit və sita formasında olur

B) ancaq trofozoit formasında olur

C) hərəkətsizdir

D) apikal kompleksə malikdir

E) sista əmələ gətirmir

**479. Entamoeba histolytica trofozoitləri üçün xasdır:**

A) hərkətlidir

B) hərəkətsizdir

C) iki nüvəlidir

D) sorucu diskə malikdir

E) flagellalara malikdir

**480. Entamoeba histolytica üçün xasdır:**

**1.Psevdopodilər;**

**2.Apikal kompleks;**

**3.Sista;**

**4.Sorucu disk;**

**5.Psevdosista;**

**6.Flagella;**

A) 1, 3

B) 3, 4

C) 2, 5

D) 1, 4

E) 1, 5

**481. Entamoeba histolytica üçün xas *deyil*:**

**1.Sorucu disk;**

**2.Apikal kompleks;**

**3.Sista;**

**4.Psevdopodilər;**

**5.Psevdosista;**

**6.Flagella;**

A) 1, 2, 5, 6

B) 1, 3, 4, 5

C) 3, 4, 5, 6

D) 1, 3, 4, 6

E) 2, 3, 5, 6

**482. Entamoeba histolytica orqanizmdə lokalizasiya olunur:**

A) yoğun bağırsaqlarda

B) nazik bağırsaqlarda

C) mədədə

D) öd yollarında

E) onikibarmaq bağırsaqda

**483. Entamoeba histolytica trofozoitlərinin bağırsaq mənfəzində bakteriyalarla qidalanaraq sista əmələ gətirməsi müşayiət olunur:**

A) simptomsuz gəzdiriciliklə

B) bağırsaqdankənar amebiazla

C) birincili bağırsaq xoralarının əmələ gəlməsilə

D) ikincili bağırsaq xoralarının əmələ gəlməsilə

E) amebiomanın əmələ gəlməsilə

**484. Entamoeba histolytica-nın bağırsaq epitelinə invaziyasında iştirak edir:**

A) ameblərin proteolitik fermentləri

B) psevdopodilər

C) ameblərin bir nüvəli sistaları

D) ameblərin dörd nüvəli sistaları

E) ameblərin sistaönü formaları

**485. Entamoeba histolytica qeyri-patogen bağırsaq amebindən fərqlənir:**

A) sitolazmasında udulmuş eritrositlərin olması ilə

B) psevdopodilərin olması ilə

C) sistaların olması ilə

D) nüvənin olması ilə

E) hərəkətli olması ilə

**486. Qanlı-selikli diareyası olan xəstənin nəcisinin nativ mikroskopiyasında 30 mkm-ə qədər ölşülü, psevdopodilərə, ekto- və endoplazmaya malik, daxilində udulmuş eritrositlər olan hərəkətli parazitlər aşkar edilmişdir. Ehtimal olunan törədici:**

A) Entamoeba histolytica

B) Toxoplasma gondii

C) Balantidium coli

D) Giardia lamblia

E) Trichomonas vaginalis

**487. 36 yaşlı kişi qarın nahiyəsində ağrılar, tenezmlər, tez-tez qanlı-selikli ishal, nəcisin "moruq jelesi" formasında olması əlamətləri ilə həkimə müraciət etmişdir. Bu əlamətlər hansı xəstəlikdən şübhələnməyə əsas verir:**

A) amebiaz

B) qiardioz

C) trixomoniaz

D) blastosistoz

E) kriptosporidioz

**488. Bağırsaq amebiazının patogenetik mexanizmi:**

A) yoğun bağırsağın xoralı zədələnməsi

B) nazik bağırsağın xoralı zədələnməsi

C) onikibarmaq bağırsağın xoralı zədələnməsi

D) nazik bağırsaq xovlarının atrofiyası

E) mezenteral limfadenit

**489. Bağırsaqdankənar amebiazın klinik təzahürlərinə aiddir:**

A) qara ciyər absesi

B) pnevmoniya

C) peritonit

D) pankreatit

E) miokardit

**490. Amebiazın diaqnostikasında istifadə edilir:**

A) mikroskopik üsul

B) komplementin birləşmə reaksiyası

C) bakterioloji üsul

D) hemaqqlütinasiyanın ləngimə reaksiyası

E) dəri-allergik reaksiya

**491. Amebiazın diaqnostikasında istifadə edilir:**

A) nəcisin nativ mikroskopiyası

B) Qram üsulu ilə boyadılmış yaxmanın mikroskopiyası

C) bakterioloji üsul

D) Ojeşko üsulu ilə boyadılmış yaxmanın mikroskopiyası

E) Buri üsulu ilə boyadılmış yaxmanın mikroskopiyası

**492. Amebiazın müalicəsində seçim preparatıdır:**

A) metronidazol

B) tetrasiklin

C) flukonazol

D) ofloksasin

E) levomisetin

**493. Cinsi yolla yoluxur:**

A) Trichomonas vaginalis

B) Giardia lamblia

C) Entoamoeba histolytica

D) Leishmania tropica

E) Trypanosoma cruzi

**494. Sista əmələ gətirmir:**

A) Trichomonas vaginalis

B) Giardia lamblia

C) Entoamoeba histolytica

D) Balantidium coli

E) Toxoplasma gondii

**495. Trichomonas vaginalis:**

A) ancaq trofozoit formasında olur

B) trofozoit və sita formasında olur

C) hərəkətsizdir

D) apikal kompleksə malikdir

E) sista əmələ gətirir

**496. Trichomonas vaginalis üçün xasdır:**

A) hərkətlidir

B) hərəkətsizdir

C) iki nüvəlidir

D) sorucu diskə malikdir

E) sista əmələ gətirir

**497. Trichomonas vaginalis üçün xasdır:**

**1.Psevdopodilər;**

**2.Apikal kompleks;**

**3.Sista;**

**4.Sorucu disk;**

**5.Psevdosista;**

**6.Flagella;**

A) ancaq 6

B) 3, 5

C) 2, 6

D) 1, 4

E) ancaq 2

**498. Trichomonas vaginalis-in törətdiyi patologiyalara aid *deyil*:**

A) qastrit

B) servisit

C) prostatit

D) uretrit

E) vezikulit

**499. 26 yaşlı kişi sidik kanalında ağrılar, göynəmə, irinli-selikli ifrazat əlamətləri ilə həkimə müraciət etmişdir. Bu əlamətlər hansı xəstəlikdən şübhələnməyə əsas verir:**

A) trixomoniaz

B) qiardioz

C) amebiaz

D) blastosistoz

E) kriptosporidioz

**500. Uretrit əlamətləri olan 30 yaşlı kişinin sidik kanalından əldə edilmiş irinin nativ mikroskopiyasında 10-15 mkm ölşülü, hərəkətli parazitlər aşkar edilmişdir. Ehtimal olunan törədici:**

A) Trichomonas vaginalis

B) Toxoplasma gondii

C) Balantidium coli

D) Giardia lamblia

E) Entamoeba histolytica

**501. Prostatit əlamətləri olan 38 yaşlı kişinin sidik çöküntüsünün nativ mikroskopiyasında 10-15 mkm ölşülü, hərəkətli parazitlər aşkar edilmişdir. Ehtimal olunan törədici:**

A) Trichomonas vaginalis

B) Toxoplasma gondii

C) Balantidium coli

D) Giardia lamblia

E) Entamoeba histolytica

**502. Urogenital trixomoniazın törədicisidir:**

A) Trichomonas vaginalis

B) Toxoplasma gondii

C) Trichomonas hominis

D) Tripanosoma cruzi

E) Trichomonas tenax

**503. Trixomoniazın diaqnostikasında müayinə *edilmir*:**

A) qan

B) prostat şirəsi

C) sidik

D) uretral ifrazat

E) vaginal ifrazat

**504. Trixomoniazın diaqnostikasında istifadə edilir:**

A) mikroskopik üsul

B) bakterioloji üsul

C) komplementin birləşmə reaksiyası

D) hemaqqlütinasiya reaksiyası

E) dəri-allergik reaksiya

**505. Trixomoniazın diaqnostikasında istifadə edilir:**

**1.Mikroskopik üsul;**

**2.Seroloji üsul;**

**3.Bioloji üsul;**

**4.Kultural üsul;**

**5.Dəri-allergik reaksiya;**

A) 1, 4

B) 1, 5

C) 1, 2

D) 3, 5

E) 2, 4

**506. Trixomoniazın müalicəsində seçim preparatıdır:**

A) metronidazol

B) tetrasiklin

C) flukonazol

D) ofloksasin

E) levomisetin

**507. Malyariya plazmodilərinin əsas sahibidir:**

A) ağcaqanadlar

B) mığmığalar

C) bitlər

D) gənələr

E) insanlar

**508. Malyariya plazmodilərinin aralıq sahibidir:**

A) insanlar

B) ağcaqanadlar

C) bitlər

D) gənələr

E) birələr

**509. Malyariya plazmodiləri cinsi yolla çoxalır:**

A) ağcaqanadlarda

B) gənələrdə

C) ətraf mühitdə

D) insan orqanizmində

E) mığmığalarda

**510. Plazmodilərin cinsi çoxalması adlanır:**

A) sporoqoniya

B) merulyasiya

C) meyoz

D) mitoz

E) şizoqoniya

**511. Plazmodilərin qeyri-cinsi çoxalması adlanır:**

A) şizoqoniya

B) merulyasiya

C) meyoz

D) mitoz

E) sporoqoniya

**512. Plazmodilərlə yoluxmuş ağcaqanadların ağız suyunda olur:**

A) sporozoitlər

B) merozoitlər

C) şizontlar

D) oosista

E) ookineta

**513. Malyariyalı xəstədən qan soran ağcaqanadı yoluxdurmaq qabiliyyətinə malikdir:**

A) qametositlər

B) merozoitlər

C) şizontlar

D) sporozoitlər

E) ookineta

**514. Malyariya plazmodiləri insan orqanizmində çoxalarkən toxuma şizoqoniyası baş verir:**

A) qaraciyəqdə

B) eritrositlərdə

C) limfada

D) makrofaqlarda

E) neytrofillərdə

**515. Malyariya plazmodilərinin həyat siklinin düzgün ardıcıllığını:**

A) qametositlər-ziqota-sporozoit-şizont-merozoit

B) qametositlər-merozoit-sporozoit-şizont-ziqota

C) qametositlər-sporozoit-merozoit-ziqota-şizont

D) şizont-merozoit-sporozoit-ziqota-qametositlər

E) ziqota-merozoit-sporozoit-şizont-qametositlər

**516. Tropik malyariyanın törədicisidir:**

A) Plasmodium falciparum

B) Plasmodium ovale

C) Plasmodium vivax

D) Plasmodium malariae

E) Plasmodium gondii

**517. Malyariya tutmaları arasındakı müddətin uzunluğu asılıdır:**

A) eritrositar şizoqoniyanın davametmə müddətindən

B) toxuma şizoqoniyanın davametmə müddətindən

C) sporoqoniyanın davametmə müddətindən

D) xəstənin yaşından

E) xəstə orqanizminin immunoloji reaktivliyindən

**518. Malyariya tutmalarının hər gün təkrar olunması nə ilə əlaqədar ola bilər?**

A) çoxsaylı yoluxmalarla

B) törədicinin virulentliyi ilə

C) orqanizmin müdafiə qabiliyyətinin zəifliyi ilə

D) tropik malyariya ilə

E) hemoqlobinopatiyalarla

**519. Qızdırma tutmaları, anemiya, qara ciyər və dalağın böyüməsi əlamətləri hansı xəstəlikdən şübhələnməyə əsas verir:**

A) malyariya

B) qarın yatalağı

C) qrip

D) qızılca

E) səpgili yatalaq

**520. Malyariya yoluxur:**

A) transmissiv mexanizmlə

B) hava-damcı mexanizmi ilə

C) təmas-məişət mexanizmi ilə

D) fekal-oral mexanizmlə

E) bütün mexanizmlərlə

**521. Malyariyanın diaqnostikasında istifadə edilir:**

A) mikroskopik üsul

B) bakterioloji üsul

C) bioloji üsul

D) dəri-allergik üsul

E) aqqlütinasiya reaksiyası

**522. Malyariyanın mikroskopik diaqnostikasında törədicinin növünü aşkar etməyə imkan verir:**

A) "nazik" qan yaxması

B) aqqlütinasiya reaksiyası

C) “asılan” damla üsulu

D) “əzilən” damla üsulu

E) “qalın” qan yaxması

**523. Malyariyanın mikroskopik diaqnostikasında istifadə edilir:**

A) Gimza üsulu

B) Qram üsulu

C) Neysser üsulu

D) qaranlıq sahəli mikroskopiya

E) Sil-Nilsen üsulu

**524. Malyariyanın profilaktikasında istifadə edilir:**

A) kimyəvi profilaktika

B) rekombinant vaksin

C) immunoqlobulin

D) kimyəvi vaksin

E) anatoksin (toksoid)

**525. Malyariyanın müalicəsində istifadə edilir:**

A) xinin

B) albendazol

C) metronidazol

D) flukonazol

E) interferon

**526. Toksoplazmalar cinsi yolla çoxalır:**

A) pişiklərin orqanizmində

B) ağcaqanadlarda

C) ətraf mühitdə

D) insan orqanizmində

E) mığmığalarda

**527. Toksoplazmalar qeyri-cinsi yolla çoxalır:**

A) insan orqanizmində

B) ağcaqanadlarda

C) ətraf mühitdə

D) pişiklərin orqanizmində

E) mığmığalarda

**528. Toxoplasma gondii üçün xasdır:**

A) apikal kompleksə malikdir

B) ancaq trofozoit formasında olur

C) iki nüvəlidir

D) sorucu diskə malikdir

E) sista əmələ gətirmir

**529. Toxoplasma gondii üçün xasdır:**

**1.Psevdopodilər;**

**2.Apikal kompleks;**

**3.Sista;**

**4.Sorucu disk;**

**5.Toxuma sistası;**

**6.Flagella;**

A) 2, 3, 5

B) 2, 3, 6

C) 3, 4, 5

D) 1, 2, 4

E) 1, 5, 6

**530. Toxoplasma gondii trofozoitləri:**

A) aypara formasındadır

B) flagellalara malik ürəkşəkillidir

C) psevdopodilərə malikdir

D) sorucu diskə malikdir

E) promastiqot və amastiqot formalarda olur

**531. Toxoplasma gondii parazitinin yoluxma mexanizmi *deyil*:**

A) tərkibində promastiqot formalar olan qidanın qəbul edilməsi

B) toxuma sistalarının ət məhsulları ılə qəbul edilməsi

C) həqiqi sistalarının ət məhsulları ılə qəbul edilməsi

D) tərkibində oosista olan qidanın qəbul edilməsi

E) pişiklərin fekalisi ilə xaric olunan oosistaların udulması

**532. Toxoplasma gondii parazitinin toxuma sistaları:**

A) xüsusi qişaya malik olmayan trofozoit yığınından ibarətdir

B) pişiklərin fekalisi ilə xaric olunur

C) pişiklərin bağırsaq epitelində hüceyrədaxili yerləşir

D) pişiklərin bağırsaq epitelində hüceyrəxarici yerləşir

E) xüsusi qişaya malik olan sporozoit yığınından ibarətdir

**533. Toxoplasma gondii parazitinin toxuma sistaları:**

A) ara sahibin toxumalarında hüceyrədaxili yerləşir

B) pişiklərin fekalisi ilə xaric olunur

C) əsas sahibin toxumalarında hüceyrəxarici yerləşir

D) pişiklərin bağırsaq epitelində hüceyrəxarici yerləşir

E) xüsusi qişaya malik olan sporozoit yığınından ibarətdir

**534. Transplasentar yoluxaraq dölün ölümünə, yaxud anadangəlmə qüsurlara səbəb olur:**

A) Toxsoplasma gondii

B) Chlamydia trachomatis

C) Trichomonas hominis

D) Leishmania donovani

E) Trichomonas vaginalis

**535. Toksoplazmozun diaqnostikasında istifadə edilir:**

A) seroloji üsul

B) bakterioloji üsul

C) parazitlərin aqqlütinasiya reaksiyası

D) hemadsorbsiya reaksiyası

E) Askolinin termopresipitasiya reaksiyası

**536. Yenidoğulmuşun qan zərdabında Toxoplasma gondii-yə qarşı İgM aşkar edilməsi təsdiq edir:**

A) ana bətnində yoluxmanı

B) parazitgəzdiriciliyi

C) ana südü ilə yoluxmanı

D) postvaksinal immuniteti

E) doğuş yollarından keçərkən yoluxmanı

**537. Yenidoğulmuşun qan zərdabında Toxoplasma gondii-yə qarşı İgG aşkar edilməsi (müvafiq İgM olmadıqda) təsdiq edir:**

A) anada müvafiq anticisimlərin olmasını

B) ana bətnində yoluxmanı

C) ana südü ilə yoluxmanı

D) postvaksinal immuniteti

E) doğuş yollarından keçərkən yoluxmanı

**538. Visseral leyşmaniozun törədicisidir:**

A) Leishmania donovani

B) Leishmania braziliensis

C) Leishmania mexicana

D) Leishmania tropica

E) Leishmania peruviana

**539. Dəri leyşmaniozunun törədicisidir:**

A) Leishmania tropica

B) Entamoeba histolytica

C) Balantidium coli

D) Trichomonas vaginalis

E) Toxoplasma gondii

**540. Leishmania tropica:**

A) promastiqot və amastiqot formalara malikdir

B) apikal kompleksə malikdir

C) iki nüvəlidir

D) sorucu diskə malikdir

E) sista əmələ gətirir

**541. Leishmania tropica üçün xasdır:**

**1.Psevdopodilər;**

**2.Apikal kompleks;**

**3.Sista;**

**4.Sorucu disk;**

**5.Psevdosista;**

**6.Flagella;**

A) ancaq 6

B) 2, 3, 6

C) 3, 4, 5

D) 1, 2, 4

E) ancaq 4

**542. Leyşmaniyaların promastiqot forması:**

A) hərəkətlidir

B) sista əmələ gətirir

C) psevdopodilərə malikdir

D) xəstə orqanizmində hüceyrədaxili yerləşir

E) xəstə orqanizmində hüceyrəxarici yerləşir

**543. Leyşmaniyaların promastiqot forması:**

A) uzunsov iyəbənzər formadadır

B) sista əmələ gətirir

C) psevdopodilərə malikdir

D) xəstə orqanizmində hüceyrədaxili yerləşir

E) xəstə orqanizmində hüceyrəxarici yerləşir

**544. Leyşmaniyaların amastiqot forması:**

A) xəstə orqanizmində hüceyrədaxili yerləşir

B) sista əmələ gətirir

C) psevdopodilərə malikdir

D) hərəkətlidir

E) flagellalara malikdir

**545. Leyşmaniyaların amastiqot forması:**

A) girdə formadadır

B) sista əmələ gətirir

C) psevdopodilərə malikdir

D) moskit milçəklərin orqanizmində hüceyrədaxili yerləşir

E) hərəkətlidir

**546. Leyşmaniozun yoluxma mexanizmi:**

A) transmissiv

B) fekal-oral

C) hava-damcı

D) təmas

E) transplasentar

**547. Leyşmaniyaların kultivasiyası üçün istifadə olunur:**

A) NNN mühiti

B) Hiss mühiti

C) Klauberq mühiti

D) Endo mühiti

E) Saburo mühiti

**548. Dəri leyşmaniozunun törədicisidir:**

A) Leishmania tropica

B) Leishmania infantum

C) Leishmania chagasi

D) Leishmania donovani

E) Leishmania archibaldii

**549. 16 yaşlı oğlanın yanaq nahiyyəsində əmələ gəlmiş düyünlü infiltrat təqribən 2 ay sonra dibi qranulyasiya toxuması ilə örtülən xoraya çevrilmişdir. Xoradan götürülmüş**

**materialdan hazırlanmış və Gimza üsulu ilə boyadılmış yaxmanın mikroskopiyasında 2-5 mkm ölçülü girdə formalı parazitlər aşkar edilmişdir. Ehtimal edilən törədici:**

A) Leishmania tropica

B) Trypanosoma cruzi

C) Plasmodium ovale

D) Leishmania donovani

E) Toxoplasma gondii

**550. Qızdırma, qaraciyər və dalağın böyüməsi, limfadenopatiya əlamətləri olan 14 yaşlı oğlandan alınmış sternal punktatdan hazırlanmış və Gimza üsulu ilə boyadılmış yaxmanın mikroskopiyasında 2-5 mkm ölçülü girdə formalı parazitlər aşkar edilmişdir. Ehtimal edilən törədici:**

A) Leishmania donovani

B) Trypanosoma cruzi

C) Plasmodium ovale

D) Leishmania tropica

E) Toxoplasma gondii

**551. NNN mühitində əldə edilmiş Leyşmaniya kulurasından hazırlanmış yaxmada müşahidə edilən morfoloji əlamətləri təsvir edin:**

A) uzunsov iyəbənzər, flagellalara malik

B) aypara formalı, flagellasız

C) girdə formalı, flagellasız

D) psevdopodilərə malik, dəyişkən formalı

E) qıvrım formalı, flagellalara malik

**552. Leyşmanioz yoluxur:**

A) moskit milçəklərilə

B) birələrlə

C) bitlərlə

D) gənələrlə

E) ağcaqanadlarla

**553. Herpesviridae fəsiləsinə aid *deyil:***

A) qızılca virusu

B) varisella-zoster virus

C) adi uçuq virusu

D) sitomeqalovirus

E) Epsteyn-Barr virusu

**554. Herpesviridae fəsiləsinə aiddir:**

A) sitomeqalovirus

B) quduzluq virusu

C) poliomielit virusu

D) epidemik parotit virusu

E) qızılca virusu

**555. Herpesviridae fəsiləsinə aiddir:**

**1.Məxmərək virusu;**

**2.Varisella-zoster virus;**

**3.Sitomeqalovirus;**

**4.Təbii çiçək virusu;**

**5.Epsteyn-Barr virusu.**

A) 2, 3, 5

B) 1, 2, 3

C) 1, 2, 5

D) 3, 4, 5

E) 2, 4, 5

**556. Herpesviruslar:**

A) DNT tərkibli qişalı viruslardır

B) DNT tərkibli qişasız viruslardır

C) RNT tərkibli qişasız viruslardır

D) RNT tərkibli qişalı viruslardır

E) DNT tərkibli, qişasız, ikosaedral kapsidə malik viruslardır

**557. Herpesviruslar:**

A) DNT tərkibli, ikosaedral kapsidə malik qişalı viruslardır

B) DNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

C) RNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

D) RNT tərkibli. spiral kapsidə malik qişalı viruslardır

E) DNT tərkibli, spiral kapsidə malik qişalı viruslardır

**558. Herpesviruslar üçün xarakterdir:**

**1.Tequment;**

**2.RNT;**

**3.Qişa;**

**4.DNT;**

**5.Spiral kapsid**

A) 1, 3, 4

B) 1, 2, 3

C) 1, 2, 5

D) 3, 4, 5

E) 2, 3, 5

**559. Herpesviruslar üçün xarakter sitopatik effektdir:**

A) çoxnüvəli hüceyrələr, yaxud simplastlar

B) sitopatik effekt əmələ gətirmir

C) Qvarnieri əlavələri

D) Neqri cisimcikləri

E) vakuolizasiya

**560. Quruluş sxeminə görə virusları müəyyən edin:**




A) 1-herpesvirus; 2-poliomielit virusu; 3-insanın immun şatışmazlıq virusu

B) 1-herpesvirus; 2-adenovirus; 3-rotavirus

C) 1-parotit virusu; 2-herpesvirus ; 3-qızılca virusu

D) 1-quduzluq virusu; 2-parvovirus; 3-qızılca virusu

E) 1-adenovirus; 2-herpesvirus; 3- insanın immun şatışmazlıq virusu

**561. Kaudri cisimcikləri hansı herpesviruslar üçün xarakter sitopatik effektdir?**

A) sadə herpes virusları

B) sitomeqalovirus

C) varisella-zoster virus

D) Epsteyn-Barr virusu

E) insanın 8-ci tip herpes virusu

**562. Sadə herpes virusları çoxalır:**

A) əsasən epitel hüceyrələrində

B) əsasən fibroblastlarda

C) əsasən B-limfositlərdə

D) əsasən T-limfositlərdə

E) əsasən lemmositlərdə

**563. Sadə herpes virusların hüceyrə kulturasında çoxalması nəticəsində əmələ gəlir:**

A) Kaudri cisimcikləri

B) Neqri cisimcikləri

C) Qvarnieri cisimcikləri

D) Paşen cisimcikləri

E) Bollinger cisimcikləri

**564. I tip sadə herpes virusları yoluxur:**

A) təmas və hava-damcı yolu ilə

B) fekal-oral mexanizmlə

C) transmissiv yolla

D) parenteral mexanizmlə

E) qida və su yolu ilə

**565. II tip sadə herpes virusları yoluxur:**

A) cinsi yolla

B) fekal-oral mexanizmlə

C) transmissiv yolla

D) parenteral mexanizmlə

E) hava-damcı yolu ilə

**566. I tip sadə herpes virusları persistensiya olunur:**

A) üçlü sinir qanqlionlarında

B) oma kələfi qanqlionlarında

C) onurğa beyninin arxa köklərinin qanqlionlarında

D) Peyer düyünlərində

E) dəri və selikli qişalarda

**567. II tip sadə herpes virusları persistensiya olunur:**

A) oma kələfi qanqlionlarında

B) üçlü sinir qanqlionlarında

C) onurğa beyninin arxa köklərinin qanqlionlarında

D) Peyer düyünlərində

E) dəri və selikli qişalarda

**568. I tip sadə herpesvirus infeksiyalarının klinik təzahürlərinə aid *deyil:***

A) qurşaqlı uçuq

B) dodaq herpesi

C) keratokonyuktivitlər

D) ensefalitlər

E) orofaringeal herpes

**569. II tip sadə herpesvirus infeksiyalarının klinik təzahürlərinə aid *deyil:***

A*)* infeksion mononukleoz

B) genital herpes

C) uşaqlıq boynu xərçəngi

D) neonatal herpes

E) aseptik meningit

**570. Neonatal herpesin törədicisidir:**

A) II tip sadə herpesvirus

B) I tip sadə herpesvirus

C) varisella-zoster virus

D) sitomeqalovirus

E) Epsteyn-Barr virusu

**571. X, Y və Z viruslarını müəyyən edin:**

| Xəstəlik | Virus |
|---|---|
| Keratokonyuktivitlər, ensefalitlər, orofaringeal herpes | X |
| Uşaqlıq boynu xərçəngi, neonatal herpes, aseptik meningit | Y |
| İnfeksion mononukleoz, oral tüklü leykoplakiya, Berkitt limfoması | Z |

A) X-I tip sadə herpesvirus; Y-II tip sadə herpesvirus; Z-Epsteyn-Barr virusu

B) X-II tip sadə herpesvirus; Y-I tip sadə herpesvirus; Z-Epsteyn-Barr virusu

C) X-Epsteyn-Barr virusu; Y-I tip sadə herpesvirus; Z- II tip sadə herpesvirus

D) X-I tip sadə herpesvirus; Y-II tip sadə herpesvirus; Z-sitomeqalovirus

E) X-I tip sadə herpesvirus; Y-II tip sadə herpesvirus; Z-varisella-zoster virus

**572. Sadə herpesvirus infeksiyalarının müalicəsində istifadə edilir:**

A) asiklovir

B) remantadin

C) tetrasiklin

D) klotrimazol

E) metronidazol

**573. Müayinə edilən şəxsin qan zərdabında II tip sadə herpes virusuna qarşı İgM və İgG aşkar edilməsi göstərir:**

A) genital herpesin aktivləşməsini

B) genital herpesə qarşı immun zərdab inyeksiya olunmasını

C) sitomeqalovirusla ilkin yoluxmanı

D) ana bətnində yoluxmanı

E) anadangəlmə herpesvirus infeksiyasını

**574. Sadə herpes virus infeksiyaları zamanı ekspress müayinə üsuludur:**

A) səpgilərdən hazırlanmış basma yaxmalarda Kaudri cisimciklərinin aşkar edilməsi

B) hüceyrə kulturalarında kultivasiya

C) toyuq embrionunda kultivasiya

D) bioloji üsul

E) seroloji üsul

**575. Varisella-zoster virus törədir:**

A) su çiçəyi

B) təbii çiçək

C) infeksion mononukleoz

D) sadə herpes

E) qızılca

**576. Varisella-zoster virus törədir:**

A) qurşaqlı uçuq

B) parotit

C) infeksion mononukleoz

D) sadə herpes

E) məxmərək

**577. Su çiçəyi yoluxur:**

A) hava-damcı yolu ilə

B) alimentar yolla

C) transmissiv yolla

D) parenteral mexanizmlə

E) fekal-oral mexanizmlə

**578. Varisella-zoster virus persistensiya olunur:**

A) onurğa beyninin arxa köklərinin qanqlionlarında

B) B-limfositlərdə

C) oma kələfi qanqlionlarında

D) Peyer düyünlərində

E) dəri və selikli qişalarda

**579. Su çiçəyi keçirmiş uşaqda törədici virusun persistensiyası nəticəsində yetkin yaşlarinda hansı xəstəliyin baş verməsi mümkündür?**

A) qurşaqlı uçuq

B) yarımkəskin ensefalit

C) Berkitt limfoması

D) qızılca

E) Q-qızdırması

**580. İnfeksion mononukleozun törədicisidir:**

A) Epsteyn-Barr virusu

B) sitomeqalovirus

C) varisella-zoster virus

D) Leptospira interrogans

E) parvovirus B19

**581. İnfeksion mononukleoz yoluxur:**

A) hava-damcı yolu ilə

B) alimentar yolla

C) transmissiv yolla

D) parenteral mexanizmlə

E) fekal-oral mexanizmlə

**582. Epsteyn-Barr virusu persistensiya olunur:**

A) B-limfositlərdə

B) onurğa beyninin arxa köklərinin qanqlionlarında

C) oma kələfi qanqlionlarında

D) timusda

E) T-limfositlərdə

**583. Epsteyn-Barr virus infeksiyalarının patogenetik mexanizmi:**

A) virusla yoluxmuş B-limfositlər T-killerlər üçün hədəfə çevrilir

B) T-killerlər virusla yoluxmuş B-limfositlərin proliferasiyasına səbəb olur

C) Epsteyn-Barr virusu B-limfositlərin çoxalmaq qabiliyyətini azaldır

D) T-killerlər virusla yoluxmuş makrofaqların proliferasiyasına səbəb olur

E) Epsteyn-Barr virusu T-limfositləri yoluxdurmaqla limfomalar törədir

**584. Epsteyn-Barr virus infeksiyaları üçün doğru mülahizədir:**

A) virusla yoluxmuş B-limfositlərin poliklonal stimulyasiyası baş verir

B) T-killerlər virusla yoluxmuş B-limfositlərin proliferasiyasına səbəb olur

C) Epsteyn-Barr virusu B-limfositlərin çoxalmaq qabiliyyətini artırır

D) T-killerlər virusla yoluxmuş makrofaqların proliferasiyasına səbəb olur

E) Epsteyn-Barr virusu T-limfositləri yoluxdurmaqla limfomalar törədir

**585. Epsteyn-Barr virus törədir:**

A) infeksion mononukleoz

B) parotit

C) herpangina

D) sadə herpes

E) qurşaqlı uçuq

**586. Epsteyn-Barr virus törədir:**

A) Berkitt limfoması

B) parotit

C) sarı qızdırma

D) sadə herpes

E) qurşaqlı uçuq

**587. Epsteyn-Barr virusunun törətdiyi xəstəlik *deyil:***

A) infeksion eritema

B) infeksion mononukleoz

C) Berkitt limfoması

D) oral tüklü leykoplakiya

E) orofaringeal karsinoma

**588. Epsteyn-Barr virus infeksiyalarina aid *deyil*:**

A) qurşaqlı uçuq

B) Hodgkin xəstəliyi

C) infeksion mononukleoz

D) oral tüklü leykoplakiya

E) Berkitt limfoması

**589. İnfeksion mononukleoz zamani qan zərdabında heterofil anticisimlərin aşkar edilməsi əlaqədardır:**

A) virusla yoluxmuş B-limfositlərin poliklonal stimulyasiyası ilə

B) T-limfositlərin virusla yoluxmuş B-limfositlərə sitotoksik təsiri ilə

C) törədici virusun antigen xüsusiyyətləri ilə

D) törədici virusun reproduksiya xüsusiyyətləri ilə

E) virusla yoluxmuş T-limfositlərin poliklonal stimulyasiyası ilə

**590. İnfeksion mononukleoz zamani periferik qanda müşahidə edilən mononukleoz əlaqədardır:**

A) virusla yoluxmuş B-limfositlərin təsirindən aktivləşmiş sitotoksik T-limfositlərlə

B) virusla yoluxmuş B-limfositlərin poliklonal stimulyasiyası ilə

C) qanda makrofaqların sayının artması ilı

D) virusla yoluxmuş makrofaqların poliklonal stimulyasiyası ilə

E) virusla yoluxmuş T-limfositlərin poliklonal stimulyasiyası ilə

**591. Xəstənin qan zərdabı ilə qoyun eritrositlərinin aqqlütinasiya reaksiyası hansı xəstəliyin diaqnozunda istifadə edilə bilər?**

A) infeksion mononukleozda

B) bütün bakterial infeksiyalarda

C) bütün virus infeksiyalarında

D) brusellozda

E) aktinomikozda

**592. Hüceyrə kulturasında "bayquş gözü"nü xatırladan nüvədaxili əlavələr əmələ gətirir:**

A) sitomeqalovirus

B) Epsteyn-Barr virusu

C) sadə herpes virusu

D) quduzluq virusu

E) təbii çiçək virusu

**593. Transplasentar yoluxaraq anadangəlmə infeksiya törədir:**

A) sitomeqalovirus

B) qrip virusu

C) epidemik parotit virusu

D) quduzluq virusu

E) təbii çiçək virusu

**594. Sitomeqalovirus infeksiyasının diaqnostikasinda istifadə edilir:**

A) seroloji üsul

B) immunoblotinq

C) dəri-allergik reaksiya

D) bakterioloji üsul

E) bioloji üsul

**595. Yenidoğulmuşun qan zərdabında sitomeqalovirusa qarşı İgM aşkar edilməsi göstərir:**

A) dölün bətndaxili yoluxmasını

B) ananın qan zərdabında müvafiq anticisimlərin olmasını

C) ananın immunizasiya olunmasını

D) anaya immun zərdab inyeksiya olunmasını

E) ananın tibb personalından yoluxmasını

**596. Yenidoğulmuşun qan zərdabında sitomeqalovirusa qarşı İgG aşkar edilməsi göstərir:**

A) ananın qan zərdabında müvafiq anticisimlərin olmasını

B) dölün bətndaxili yoluxmasını

C) anada immun çatışmazlıq olmasını

D) yenidoğulmuşun doğuş yollarından yoluxmasını

E) yenidoğulmuşun tibb personalından yoluxmasını

**597. Adenoviruslar:**

A) DNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

B) DNT tərkibli, ikosaedral kapsidə malik qişalı viruslardır

C) RNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

D) RNT tərkibli. spiral kapsidə malik qişalı viruslardır

E) DNT tərkibli, spiral kapsidə malik qişalı viruslardır

**598. Quruluş sxeminə görə virusları müəyyən edin:**




A) 1-adenovirus; 2-poliomielit virusu; 3-insanın immun şatışmazlıq virusu

B) 1-herpesvirus; 2-adenovirus; 3-rotavirus

C) 1-adenovirus; 2-herpesvirus ; 3-qızılca virusu

D) 1-quduzluq virusu; 2-parvovirus; 3-qızılca virusu

E) 1-adenovirus; 2-herpesvirus; 3- insanın immun şatışmazlıq virusu

**599. Adenoviruslar sahib hüceyrəyə birləşir:**

A) fibrillər vasitəsilə

B) pentonlar vasitəsilə

C) heksonlar vasitəsilə

D) qranlar vasitəsilə

E) vertikallar vasitəsilə

**600. Fekal-oral mexanizmlə yoluxaraq qastroentrit törədə bilər:**

A) adenovirus

B) herpesvirus

C) sitomeqalovirus

D) paraqrip virusu

E) qızilca virusu

**601. Uşaqlarda törətdiyi respirator infeksiyalar bir çox hallarda konyuktivitlə müşayiət olunur:**

A) adenovirus

B) qrip virusu

C) sitomeqalovirus

D) RS-virus

E) rubivirus

**602. Epidemik konyuktivitin törədicisidir:**

A) adenovirus

B) ECHO virus

C) sitomeqalovirus

D) paraqrip virusu

E) qızılca virusu

**603. Adenoviruslar persistensiya olunur:**

A) udlaq badamciqlarında

B) onurğa beyninin arxa köklərinin qanqlionlarında

C) üçlü sinir qanqlionlarında

D) sümük iliyində

E) T-limfositlərdə

**604. Adenoviruslarla törədilir:**

**1.Pnevmoniya;**

**2.Konyuktivit;**

**3.Qastroenterit;**

**4.Herpangina;**

**5.Miokardit.**

A) 1, 2, 3

B) 1, 4, 5

C) 1, 2, 5

D) 3, 4, 5

E) 2, 3, 4

**605. Papillomaviruslar:**

A) DNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

B) DNT tərkibli, ikosaedral kapsidə malik qişalı viruslardır

C) RNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

D) RNT tərkibli. spiral kapsidə malik qişalı viruslardır

E) DNT tərkibli, spiral kapsidə malik qişalı viruslardır

**606. Papillomaviruslar:**

A) hüceyrə kulturasında inkişaf etmirlər

B) RNT tərkibli viruslardır

C) spiral kapsidə malikdirlər

D) qişalı viruslardır

E) neyrotrop viruslardır

**607. Papillomavirusların hüceyrə kulturalarında kultivasiya edilə bilməməsi əlaqədardır:**

A) virusların reproduksiya fazalarının epidermisin ayrı-ayrı qatlarında baş verməsi ilə

B) RNT tərkibli virus olması ilə

C) spiral kapsidə malik olması ilə

D) dermatrop xüsusiyyətə malik olması ilə

E) virusun şiş transformasiyası törətməsi ilə

**608. Papillomavirusların hansı genotipləri daha yüksək kanserogenliyə malikdir:**

A) 16-cı və 18-ci tiplər

B) 31-ci və 33-cü tiplər

C) 26-cı və 28-ci tiplər

D) 51-59-cu tiplər

E) bütün tiplər

**609. Papillomavirusların törətdiyi xəstəliklərə *aid deyil:***

A) infeksion eritema

B) dəri ziyili

C) servikal kanser

D) verrukoz laringit

E) dərinin papilloması

**610. Papillomavirusların kanserogen təsirinin mexanizmidir:**

A) şiş supressiyaedici p53 və Rb genlərinin inaktivləşdirilməsi

B) şiş supressiyaedici p53 və Rb genlərinin aktivləşdirilməsi

C) dəri epidermisində reproduksiya

D) epidermisin ayrı-ayrı qatlarında reproduksiya

E) inteqrativ tipli infeksiya

**611. Poliomaviruslar:**

A) DNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

B) DNT tərkibli, ikosaedral kapsidə malik qişalı viruslardır

C) RNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

D) RNT tərkibli. spiral kapsidə malik qişalı viruslardır

E) DNT tərkibli, spiral kapsidə malik qişalı viruslardır

**612. Poliomaviruslara aiddir:**

**1.Sitomeqalovirus;**

**2.ECHO virus;**

**3.BK virus;**

**4.JC virus;**

**5.RS-virus;**

**6.SV-40 virusu;**

A) 3, 4, 6

B) 2, 5, 6

C) 1, 2, 5

D) 1, 3, 4

E) 2, 3, 5

**613. Parvoviruslar:**

A) DNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

B) DNT tərkibli, ikosaedral kapsidə malik qişalı viruslardır

C) RNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

D) RNT tərkibli. spiral kapsidə malik qişalı viruslardır

E) DNT tərkibli, spiral kapsidə malik qişalı viruslardır

**614. Genomu birsaplı DNT-dən ibarət olan viruslardır:**

A) Parvoviruslar

B) Poliomaviruslar

C) Adenoviruslar

D) Herpesviruslar

E) Poksviruslar

**615. İnfeksion eritemanın törədicisidir:**

A) parvovirus B19

B) SV-40 virusu

C) RS-virus

D) məxmərək virusu

E) varisella-zoster virusu

**616. Parvoviruslar reproduksiyası baş verir:**

A) eritrositlərdə

B) epitel hüceyrələrində

C) neyronlarda

D) fibroblastlarda

E) epidermisdə

**617. Parvoviruslarla törədilir:**

**1.Dərinin papilloması;**

**2.Aplastik anemiya;**

**3.İnfeksion eritema;**

**4.Zoster;**

**5.Dölün hidropsu;**

A) 2, 3, 5

B) 3, 4, 5

C) 1, 2, 5

D) 1, 2, 4

E) 2, 4, 5

**618. Qrip virusu:**

A) RNT tərkibli. spiral kapsidə malik qişalı viruslardır

B) DNT tərkibli, ikosaedral kapsidə malik qişalı viruslardır

C) RNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

D) DNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

E) RNT tərkibli. spiral kapsidə malik qişasız viruslardır

**619. Qrip virusunun genomu:**

A) birsaplı seqmentləşmiş mənfi-RNT-dən ibarətdir

B) birsaplı seqmentləşməmiş mənfi-RNT-dən ibarətdir

C) ikisaplı seqmentləşməmiş müsbət-RNT-dən ibarətdir

D) ikisaplı seqmentləşməmiş DNT-dən ibarətdir

E) ikisaplı seqmentləşmiş DNT-dən ibarətdir

**620. Qrip virusunun səthi çıxıtıları ibarətdir:**

**1.P1-zülal;**

**2.H-qlikoprotein;**

**3.P2-zülal;**

**4.N-qlikoprotein;**

**5.M-zülal;**

**6.P3-zülal;**

A) 2, 4

B) 5, 6

C) 1, 5

D) 3, 6

E) 1, 6

**621. Qrip virusunun səthi H-qlikoproteinləri detergentlə kənarlaşdırıldıqdan sonra:**

A) virus sahib hüceyrəyə birləşə bilməz

B) virus sahib hüceyrəyə daxil olduqdan sonra deproteinasiya oluna bilməz

C) virus hüceyrə membranından tumurcuqlana bilməz

D) virusun reproduksiyası zülalların sintezi səviyyəsində dayanar

E) virusun reproduksiyası nuklein turşları sintezi səviyyəsində dayanar

**622. Qrip virusunun hansı tipi daha çox antigen dəyişkənliyinə malikdir:**

A) A tipi

B) C tipi

C) B tipi

D) E tipi

E) D tipi

**623. Qrip virusunun yeni yarımtipinin əmələ gəlmə səbəbidir:**

A) şift

B) dreyf

C) komplementasiya

D) fenotipik qarışma

E) transduksiya

**624. Qrip virusunun optimal kultivasiya modelidir:**

A) toyuq embrionları

B) Zaks mühiti

C) 199 mühiti

D) yenidoğulmuş ağ siçanlar

E) Xenks mühiti

**625. "Quş qripi" qrip virusunun hansı yarımtipi ilə törədilir:**

A) H5N1

B) H1N1

C) H2N2

D) H3N2

E) H5N2

**626. Qrip virusunun ilkin reproduksiyası baş verir:**

A) əsasən yuxarı tənəffüs yollarında

B) əsasən aşağı tənəffüs yollarında

C) əsasən ağciyər alveollarında

D) əsasən mərkəzi sinir sistemində

E) əsasən mədə-bağırsaq traktında

**627. Qripin patogenetik xüsusiyyətidir:**

A) yuxarı tənəffüs yolları səthi epitelinin destruksiyası

B) virusun kapsid zülallarının yuxarı tənəffüs yollarına toksik təsiri

C) virusun kapsid zülallarının ağciyər alveollarında iltihab törətməsi

D) virusspesifik fermentlərin mərkəzi sinir sisteminə toksik təsiri

E) virus zülallarının superantigen xüsusiyyəti

**628. Qrip xəstəliyində ikincili bakterial infeksiyalarin inkişafı əlaqədardır:**

A) yuxarı tənəffüs yolları epitelinin zədələnməsi ilə

B) yuxarı tənəffüs yolları epitelinin parçalanma məsullarının orqanizmə toksik təsiri ilə

C) yuxarı tənəffüs yolları epitelinin parçalanma məsullarının kapillyarlara toksik təsiri ilə

D) virusspesifik fermentlərin bakteriyaların inkişafına şərait yaratması ilə

E) virus zülallarının makrofaqların faqositar funksiyalarını zəiflətməsi ilə

**629. Qrip xəstəliyində ikincili bakterial infeksiyalarin əsas törədiciləridir:**

A) S.aureus, S.pneumoniae, H.influenzae

B) S.epidermidis, S.viridans, B.pertussis

C) S.epidermidis, E.coli, B.catarrhalis

D) P.aeruginosa, S.agalactiae, B.fragilis

E) S.epidermidis, S.viridans, H.influenzae

**630. Qrip xəstəliyinin ən ciddi fəsadlaşmasıdır:**

A) pnevmoniya

B) faringit

C) haymorit

D) tonzillit

E) konyuktivit

**631. Qrip xəstəliyinin ən ciddi fəsadlaşmasıdır:**

A) Rey sindromu

B) bronxit

C) haymorit

D) Reyno sindromu

E) konyuktivit

**632. Qrip xəstəliyində protektiv effektə malikdir:**

A) H- və N-qlikoproteinlərinə qarşı anticisimlər

B) ribonukleoproteinə qarşı anticisimlər

C) kapsid zülallarına qarşı anticisimlər

D) virionun qişasına qarşı anticisimlər

E) M-zülalına qarşı anticisimlər

**633. Qripin təcili diaqnostika üsuludur:**

A) immunoflüoressensiya üsulu

B) virusoloji üsul

C) seroloji üsul

D) bioloji üsul

E) dəri-allergik reaksiya

**634. Qripin təcili diaqnostika üsuludur:**

A) zəncirvari polimeraza reaksiyası

B) virusoloji üsul

C) seroloji üsul

D) bioloji üsul

E) dəri-allergik reaksiya

**635. Qrip virusunun toyuq embrionlarında indikasiya üsuludur:**

A) hemaqqlütinasiya reaksiyası

B) zəncirvari polimeraza reaksiyası

C) immunoferment analiz

D) presipitasiya reaksiyası

E) immunolotinq

**636. Qrip virusunun identifikasiyasında istifadə edilir:**

A) hemaqqlütinasiyanın ləngimə reaksiyası

B) hemaqqlütinasiya reaksiyası

C) immunoelektroforez

D) presipitasiya reaksiyası

E) immunoblotinq

**637. Qripin seroloji diaqnostikasında qoşa qan zərdablarından istifadə edilir:**

A) anticisimlərin titrinin artma dinamikasını müəyyənləşdirmək üçün

B) anticisimlərin avidliyini müəyyənləşdirmək üçün

C) anticisimlərin affinliyini müəyyənləşdirmək üçün

D) anticisimlərin spesifikliyini müəyyənləşdirmək üçün

E) virus antigenlərinin titrinin artma dinamikasını müəyyənləşdirmək üçün

**638. Qripin seroloji diaqnostikasında anticisimlərin titrinin artma dinamikasını müəyyənləşdirmək üçün:**

A) qoşa qan zərdablarından istifadə edilir

B) bir neçə seroloji reaksiya qoyulur

C) immunoferment analiz isti və soyuq şəraitlərdə qoyulur

D) hemaqqlütinasiyanın ləngimə reaksiyasından istifadə edilir

E) virus antigenlərinin titrinin artma dinamikası müəyyənləşdirilir

**639. Qripin profilaktikası məqsədilə tətbiq edilir:**

A) inaktivləşdirilmiş vaksinlər

B) anatoksin

C) immun zərdab

D) immunoqlobulin

E) antitoksik zərdab

**640. Paramiksoviruslar:**

A) RNT tərkibli, spiral kapsidə malik qişalı viruslardır

B) DNT tərkibli, ikosaedral kapsidə malik qişalı viruslardır

C) RNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

D) DNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

E) RNT tərkibli. spiral kapsidə malik qişasız viruslardır

**641. Paramiksoviruslar üçün xarakter sitopatik effektdir:**

A) sinsiti

B) Paşen cisimcikləri

C) Qvarnieri əlavələri

D) Neqri cisimcikləri

E) vakuolizasiya

**642. Hüceyrə kulturalarında paramiksovirusların sinsiti əmələ gətirməsini təmin edir:**

A) F-zülal

B) G-zülal

C) H-zülal

D) HN-zülal

E) NP-zülal

**643. Paramiksovirusların F-zülalı:**

A) hüceyrə kulturalarında sinsiti əmələ gəlməsinə səbəb olur

B) hüceyrə kulturalarında Paşen cisimciklərinin əmələ gəlməsinə səbəb olur

C) hüceyrə kulturalarında nüvədaxili əlavələrin əmələ gəlməsinə səbəb olur

D) hüceyrə kulturalarında Qvarnieri əlavələrinin əmələ gəlməsinə səbəb olur

E) sahib hüceyrədə deproteinasiyanı təmin edir

**644. Paramiksovirusların səthi zülallarıdır:**

**1.P-zülal;**

**2.HN-zülal;**

**3.L-zülal;**

**4.G-zülal;**

**5.F-zülal;**

**6.NP-zülal;**

A) 2, 4, 5

B) 1, 5, 6

C) 1, 3, 5

D) 3, 4, 6

E) 2, 5, 6

**645. Paramiksovirusların səthi zülalları *deyil:***

**1.P-zülal;**

**2.HN-zülal;**

**3.L-zülal;**

**4.G-zülal;**

**5.F-zülal;**

**6.NP- zülal;**

A) 1, 3, 6

B) 2, 4, 5

C) 1, 3, 5

D) 3, 4, 6

E) 2, 5, 6

**646. Paramiksoviruslara aid *deyil:***

A) qrip virusu

B) paraqrip virusu

C) parotit virusu

D) RS-virus

E) qızılca virusu

**647. Paramiksoviruslara aiddir:**

A) paraqrip virusu

B) qrip virusu

C) parvovirus

D) sitomeqalovirus

E) poliomielit virusu

**648. Paramiksoviruslara aiddir:**

**1.Məxmərək virusu;**

**2.Parotit virusu;**

**3.Sitomeqalovirus;**

**4.RS-virus;**

**5.Qizilca virusu;**

A) 2, 4, 5

B) 1, 2, 3

C) 1, 2, 5

D) 3, 4, 5

E) 2, 3, 5

**649. Paraqrip virusunun ilkin reproduksiyası baş verir:**

A) yuxarı tənəffüs yollarında

B) əsasən aşağı tənəffüs yollarında

C) əsasən ağciyər alveollarında

D) mərkəzi sinir sistemində

E) əsasən mədə-bağırsaq traktında

**650. Paraqrip virusunun hüceyrə kulturalarinda indikasiya üsuludur:**

A) hemadsorbsiya reaksiyası

B) zəncirvari polimeraza reaksiyası

C) immunoferment analiz

D) presipitasiya reaksiyası

E) komplementin birləşmə reaksiyası

**651. Paramiksoviruslara aiddir:**

A) RS-virus

B) qrip virusu

C) parvovirus

D) Epsteyn-Barr virusu

E) Koksaki virusu

**652. Respirator-sinsitial virus üçün hansı glikoprotein çıxıntı xarakterdir**

A) G-qlikoprotein

B) N-qlikoprotein

C) H-qlikoprotein

D) HN-qlikoprotein

E) NP-qlikoprotein

**653. Respirator-sinsitial virusun ilkin reproduksiyası baş verir:**

A) yuxarı tənəffüs yollarında

B) əsasən aşağı tənəffüs yollarında

C) əsasən ağciyər alveollarında

D) mərkəzi sinir sistemində

E) əsasən mədə-bağırsaq traktında

**654. Respirator-sinsitial virus infeksiyalarının əsas klinik əlamətidir:**

A) bronxiolit və pnevmoniya

B) inaq və laringit

C) rinit və zökəm

D) meninqoensefalit

E) plevrit

**655. Körpə uşaqlarda Respirator-sinsitial virus infeksiyalarının ən çox rast gəlinən fəsadlaşmasıdır:**

A) otit

B) Rey sindromu

C) haymorit

D) meningit

E) konyuktivit

**656. Respirator-sinsitial virusun hüceyrə kulturalarinda indikasiyası aparılır:**

A) sitopatik təsirin xarakterinə görə

B) zəncirvari polimeraza reaksiyası vasitəsilə

C) immunoferment analiz vasitəsilə

D) presipitasiya reaksiyası vasitəsilə

E) hemaqqlütinasiya reaksiyası vasitəsilə

**657. Paramiksoviruslarin hemaqqlütinasiyaedici xassəyə malik olmayan nümayəndəsidir:**

A) RS-virus

B) paraqrip virusunun IV serotipi

C) parotit virusu

D) qızılca virusu

E) paraqrip virusunun I və II serotipləri

**658. Paramiksoviruslara aiddir:**

A) epidemik parotit virusu

B) qrip virusu

C) parvovirus

D) Epsteyn-Barr virusu

E) Koksaki virusu

**659. Epidemik parotit yoluxur:**

A) hava-damcı yolu ilə

B) alimentar yolla

C) transmissiv yolla

D) parenteral mexanizmlə

E) fekal-oral mexanizmlə

**660. Epidemik parotit virusunun ilkin reproduksiyası baş verir:**

A) yuxarı tənəffüs yollarında

B) aşağı tənəffüs yollarında

C) ağciyər alveollarında

D) mərkəzi sinir sistemində

E) mədə-bağırsaq traktında

**661. Epidemik parotitin xarakter əlamətidir:**

A) qulaqaltı vəzin şişməsi

B) konyuktivit

C) frontit

D) rinit

E) laringit

**662. Epidemik parotitin ən çox rast gəlinən fəsadlaşmalarındandır:**

A) orxit və ooforit

B) Rey sindromu

C) karlıq və korluq

D) sinusit

E) konyuktivit

**663. Epidemik parotitin ən çox rast gəlinən fəsadlaşmalarındandır:**

A) meninqensefalit

B) hepatit

C) karlıq və korluq

D) haymorit

E) konyuktivit

**664. Epidemik parotitin profilaktikası məqsədilə tətbiq edilir:**

A) diri vaksin

B) anatoksin

C) immun zərdab

D) rekombinant vaksin

E) antitoksik zərdab

**665. Qızılca virusu üçün xarakter *deyil:***

A) bətndaxili infeksiya törədir

B) hemaqqlütinasiyaedici aktivliyə malikdir

C) hava-damcı yolu ilə yoluxur

D) nüvədaxili əlavələr əmələ gətirir

E) ətraf mühitdə davamsızdır

**666. Qızılca virusu digər paramiksoviruslardan fərqlənir:**

A) nüvədaxili əlavələr əmələ gətirməsi ilə

B) hemaqqlütinasiyaedici aktivliyi ilə

C) F-zülalına malik olması ilə

D) kultivasiya şəraitinə görə

E) yoluxma yollarına görə

**667. Paramiksoviruslara aiddir:**

A) qızılca virusu

B) qrip virusu

C) məxmərək virusu

D) Epsteyn-Barr virusu

E) poliomielit virusu

**668. Qızılca virusu üçün hansı glikoprotein çıxıntı xarakterdir?**

A) H-qlikoprotein

B) G-qlikoprotein

C) N-qlikoprotein

D) HN-qlikoprotein

E) NP-qlikoprotein

**669. Qızılca virusu yoluxur:**

A) hava-damcı yolu ilə

B) alimentar yolla

C) fekal-oral mexanizmlə

D) transmissiv yolla

E) parenteral mexanizmlə

**670. Qızılca virusunun ilkin reproduksiyası baş verir:**

A) yuxarı tənəffüs yollarında

B) aşağı tənəffüs yollarında

C) ağciyər alveollarında

D) mərkəzi sinir sistemində

E) epidermisdə

**671. Qızılca xəstəliyində səpgilərin əmələ gəlməsi əlaqədardır:**

A) damarların yoluxmuş endotel hüıeyrələrilə T-limfositlərin qarşılıqlı təsiri ilə

B) virusun epidermisdə reproduksiyası ilə

C) virusun dermatrop təsiri ilə

D) T-limfositlərin iştirakı ilə virusun hemolitik təsiri ilə

E) virusun hemaqqlütinasiyaedici təsiri ilə

**672. Qızılca səpgiləri üçün xarakter *deyil:***

A) ilk səpgilər qarın nahiyəsində əmələ gəlir

B) yerində qabiqlanma müşahidə edilir

C) mərhələli əmələ gəlir

D) ləkəli-papulyoz xarakterlidir

E) hüceyrəvi immuniteti qüsurlu olan şəxslərdə müşahidə edilmir

**673. Qızılca üçün xarakterdir:**

A) mərhələli səpgilər

B) diareya

C) sarılıq

D) vezikulyoz səpgilər

E) pustulalar

**674. Qızılca üçün xarakterdir:**

A) Koplik ləkələri

B) vezikulyoz səpgilər

C) pustulalar

D) ənsə limfa düyünlərinin şişkinləşməsi

E) ifliclər

**675. Qızılcanın ən çox rast gəlinən fəsadlaşmasıdır:**

A) pnevmoniya

B) hepatit

C) nefrit

D) plevrit

E) splenomeqaliya

**676. Qızılcanın fəsadlaşmalarına aid *deyil:***

A) nefrit

B) pnevmoniya

C) otit

D) postinfeksion ensafalomielit

E) yarımkəskin sklerozlaşdırıcı panensefalit

**677. Qızılcanın profilaktikasında tətbiq edilir:**

A) diri vaksin

B) anatoksin

C) immun zərdab

D) inaktivləşdirilmiş vaksin

E) antitoksik zərdab

**678. Qızılcalı xəstə ilə təmasda olan uşaqlara profilaktik məqsədlə tətbiq edilir:**

A) immunoqlobulin

B) diri vaksin

C) anatoksin

D) inaktivləşdirilmiş vaksin

E) antitoksik zərdab

**679. Paramiksoviruslara aiddir:**

**1.RS-virus;**

**2.Sitomeqalovirus;**

**3.Məxmərək virusu;**

**4.Qızılca virusu;**

**5.Paraqrip virusu;**

**6.Parotit virusu;**

A) 1, 4, 5, 6

B) 1, 2, 3, 4

C) 2, 3, 4, 5

D) 2, 3, 4, 6

E) 3, 4, 5, 6

**680. X, Y və Z paramiksoviruslarını müəyyən edin:**

| Xassələr | Virus |
|---|---|
| Xarici qişada H- və N-qlikoproteinləri əvəzinə G-qlikoproteini var | X |
| Xarici qişada H-qlikoproteini var, N-qlikoproteini yoxdur | Y |
| Xarici qişada HN-qlikoproteinləri var | Z |

A) X-RS-virus; Y-qızılca virusu; Z-paraqrip və parotit virusu

B) X-qızılca virusu; Y-RS-virus; Z-paraqrip və parotit virusu

C) X-paraqrip və parotit virusu; Y-RS-virus; Z-qızılca virusu

D) X-RS-virus; Y-paraqrip və parotit virusu; Z-qızılca virusu

E) X-qızılca virusu; Y-paraqrip və parotit virusu; Z-RS-virus

**681. Reoviruslar:**

A) RNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

B) DNT tərkibli, ikosaedral kapsidə malik qişalı viruslardır

C) RNT tərkibli, spiral kapsidə malik qişasız viruslardır

D) DNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

E) DNT tərkibli, spiral kapsidə malik qişalı viruslardır

**682. Reovirusların genomu:**

A) ikisaplı seqmentləşmiş mənfi-RNT-dən ibarətdir

B) birsaplı seqmentləşməmiş mənfi-RNT-dən ibarətdir

C) birsaplı seqmentləşməmiş müsbət-RNT-dən ibarətdir

D) ikisaplı seqmentləşməmiş DNT-dən ibarətdir

E) ikisaplı seqmentləşmiş DNT-dən ibarətdir

**683. Reoviruslar üçün xarakterdir:**

A) ikiqatlı ikosaedral kapsid

B) təksaplı seqmentləşməmiş RNT-dən ibarət genom

C) təkqatlı ikosaedral kapsid

D) ikisaplı seqmentləşmiş DNT-dən ibarət genom

E) təkqatlı spiral kapsid

**684. Reovirusların siqma-1 zülalı detergentlə kənarlaşdırıldıqdan sonra:**

A) virus sahib hüceyrəyə birləşə bilməz

B) virus sahib hüceyrəyə daxil olduqdan sonra deproteinasiya oluna bilməz

C) virus hüceyrə membranından tumurcuqlana bilməz

D) virusun reproduksiyası zülalların sintezi səviyyəsində dayanar

E) virusun reproduksiyası nuklein turşları sintezi səviyyəsində dayanar

**685. Antivirus preparatların təsirindən Reoviruslarda hansı dəyişiklik müşahidə edilə bilər?**

A) xarici kapsidin itirilməsi

B) siqma-1 zülalının denaturasiyası

C) xarici kapsidin şişməsi

D) myu-1c zülalının itirilməsi

E) genom seqmentlərinin birləşməsi

**686. Rotaviruslar:**

A) RNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

B) DNT tərkibli, ikosaedral kapsidə malik qişalı viruslardır

C) RNT tərkibli, spiral kapsidə malik qişasız viruslardır

D) DNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

E) DNT tərkibli, spiral kapsidə malik qişalı viruslardır

**687. Rotavirusların genomu:**

A) ikisaplı seqmentləşmiş mənfi-RNT-dən ibarətdir

B) birsaplı seqmentləşməmiş mənfi-RNT-dən ibarətdir

C) birsaplı seqmentləşməmiş müsbət-RNT-dən ibarətdir

D) ikisaplı seqmentləşməmiş DNT-dən ibarətdir

E) ikisaplı seqmentləşmiş DNT-dən ibarətdir

**688. Rotaviruslar üçün xarakterdir:**

A) ikiqatlı ikosaedral kapsid

B) təksaplı seqmentləşməmiş RNT-dən ibarət genom

C) təkqatlı ikosaedral kapsid

D) ikisaplı seqmentləşmiş DNT-dən ibarət genom

E) təkqatlı spiral kapsid

**689. Rotaviruslar yoluxur:**

A) fekal-oral mexanizmlə

B) hava-toz yolu ilə

C) hava-damcı yolu ilə

D) transmissiv yolla

E) parenteral mexanizmlə

**690. Rotavirusların reproduksiyası baş verir:**

A) nazik bağırsaq xovlarının epitel hüceyrələrində

B) aşağı tənəffüs yollarının selikli qişasında

C) ağciyər alveollarında

D) mərkəzi sinir sistemində

E) yuxarı tənəffüs yollarının selikli qişasında

**691. Rotavirus infeksiyaları üçün xarakterdir:**

A) diareya

B) səpgilər

C) sarılıq

D) pnevmoniya

E) faringit

**692. Pikornaviruslar:**

A) RNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

B) DNT tərkibli, ikosaedral kapsidə malik qişalı viruslardır

C) RNT tərkibli, spiral kapsidə malik qişasız viruslardır

D) DNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

E) RNT tərkibli, ikosaedral kapsidə malik qişalı viruslardır

**693. Pikornavirusların genomu:**

A) birsaplı seqmentləşməmiş müsbət-RNT-dən ibarətdir

B) birsaplı seqmentləşmiş mənfi-RNT-dən ibarətdir

C) birsaplı seqmentləşmiş müsbət-RNT-dən ibarətdir

D) ikisaplı seqmentləşməmiş DNT-dən ibarətdir

E) ikisaplı seqmentləşmiş DNT-dən ibarətdir

**694. Pikornavirusların sahib hüceyrələrlə birləşməsində iştirak edir:**

A) kapsid qişasının kanyonları

B) kapsid qişasını əmələ gətirən pentomerin zirvələri

C) VPg zülalı

D) RNT molekulu

E) RNT və VPg zülalının birləşməsi

**695. Pikornaviruslar üçün xarakterdir:**

A) reproduksiya prosesində genom RNT məlumat RNT rolunu oynayır

B) reproduksiya prosesində genom RNT ribosom RNT rolunu oynayır

C) reproduksiya sahib hüceyrələrin nüvəsində baş verir

D) virusun genomu ikisaplı seqmentləşməmiş DNT-dən ibarətdir

E) virusun kapsidi spiral simmetriyalıdır

**696. Enteroviruslara aiddir:**

**1.RS-virus;**

**2.Poliomielit virusu;**

**3.Məxmərək virusu;**

**4.ECHO virus;**

**5.Koksaki virusu;**

**6.Parotit virusu;**

A) 2, 4, 5

B) 1, 2, 3

C) 3, 4, 5

D) 4, 5, 6

E) 1, 3, 6

**697. Poliomielit virusları:**

A) RNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

B) DNT tərkibli, ikosaedral kapsidə malik qişalı viruslardır

C) RNT tərkibli, spiral kapsidə malik qişasız viruslardır

D) DNT tərkibli, ikosaedral kapsidə malik qişasız viruslardır

E) RNT tərkibli, ikosaedral kapsidə malik qişalı viruslardır

**698. Quruluş sxeminə görə virusları müəyyən edin:**




A) 1-insanın immun çatışmazlıq virusu; 2-adenovirus; 3-poliomielit virusu

B) 1-herpesvirus; 2-adenovirus; 3-rotavirus

C) 1-herpesvirus; 2-adenovirus; 3-qızılca virusu

D) 1-quduzluq virusu; 2-parvovirus; 3-qızılca virusu

E) 1- poliomielit virusu; 2- adenovirus; 3-insanın immun şatışmazlıq virusu

**699. Poliomielit virusları yoluxur:**

A) fekal-oral mexanizmlə

B) hava-toz yolu ilə

C) transplasentar yolla

D) transmissiv yolla

E) parenteral mexanizmlə

**700. Poliomielit viruslarının ilkin reproduksiyası baş verir:**

A) udlaq həlqəsinin və nazik bağırsağın limfa follikullarında

B) tənəffüs yollarının selikli qişasının epitel hüceyrələrində

C) ağciyər alveollarında

D) mərkəzi sinir sistemində

E) onurğa beyninin boz maddəsinin ön buynuzlarında

**701. Poliomielit virusları xəstə orqanizmindən ətraf mühitə xaric olunur:**

A) nəcislə

B) sidiklə

C) tər və piy vəzləri ilə

D) göz yaşı ilə

E) bəlğəmlə

**702. Poliomielitin paralitik forması inkişaf edir:**

A) virusun onurğa beyninin boz maddəsinin ön buynuzlarında çoxalması nəticəsində

B) virusun baş beynin qabıq maddəsində çoxalması nəticəsində

C) virusun periferk sinirləri zədələməsi nəticəsində

D) virusun periferk sinirlərin mielin qişasını zədələməsi nəticəsində

E) virusun onurğa beyninin ağ maddəsində çoxalması nəticəsində

**703. Poliomielit virusları ilə törədilir:**

A) aseptik meningitlər

B) irinli meningitlər

C) pielit

D) pnevmoniya

E) radikulit

**704. Poliomielitin fəsadlaşmalarına aiddir:**

A) proqressiv əzələ atrofiyası

B) irinli meningitlər

C) bel quruluğu

D) postinfeksion ensafalomielit

E) yarımkəskin sklerozlaşdırıcı panensefalit

**705. Poliomielitdən sonra yaranan immunitet:**

A) ömürlük tiposfesik xarakterlidir

B) qısamüddətli tiposfesik xarakterlidir

C) təbii passiv xarakterlidir

D) transplasentar yolla ötürülmür

E) təkrar infeksiyadan müdafiə etmir

**706. Poliomielit virusunu əldə etmək olar:**

A) nəcisdən

B) sidikdən

